Kitabın adı: **Xəvariclər və müasir ideoloğiyaları**
Müəllif: **Şeyx Əbdül Mühsin əl-Ubeykan**

**Tərcüməçi:** Rahim Muradlı
**Redaktor:** Fərahim Sələfi
**Məsləhətçi:** Qamət Süleyman
Ramil Həsən

www.abubakr-mescidi.com

# XƏVARİCLƏR
# VƏ
# MÜASIR İDEOLOGİYALARI

Əli ibn Əbi Talib *(radiyallahu anhu)* deyir: Mən Peyğəmbərin ε belə dediyini eşitdim. ***"Axır zamanda yaşca cavan və ağıldan zəif insanlar peyda olacaqdır. Onlar məxluqatın ən yaxşısının sözü ilə danışacaq, İslamdan, oxun ovlanmış şikardan çıxdıyı kimi çıxacaqlar. Onların imanı boğazlarından aşağı keçməyəcəkdir. Belə kəslərə qarşı mübarizə aparın. Bu işi görənə Qiyamət günü mükafat vardır"[1].***

Əbül-Aliya *(Allah ona rəhmət etsin!)* demişdir: "Mən Quranı sizin Peyğəmbərinizin ε vəfatından 10 il sonra oxudum. Ona görə də Allah mənə iki xeyir bəxş etdi və bilmirəm ki, ikisindən hansı daha yaxşıdır: Allahın məni İslamın doğru yoluna yönəltməsi və yaxud Allahın məni həruri *(xəvaric)* etməməsi"[2].

---

[1] *Buxari № 361, Muslim № 1066 və Əbu Davud № 4767 rəvayət etmişdir.*

[2] **Səhih:** Əbdur-Rəzzaq (10/153), İbn Sa`d (7/114), əl-Laləkayi *Şərhu Usulu-Etiqad* (*№* 230), İbn Əbi Zəməneyn *Usulus-Sunnəh* (*№* 240), əl-Həravii *Zammul-Kəlaam (qaaf 89/bəə)* və əz-Zəhəbi *əs-Siyərdə* qeyd etmişdir*(4.212).*

# ÖN SÖZ:[3]

Həmd Allaha məxsusdur. Biz Ona həmd edir, Onu köməyə çağırır və Ondan bağışlanma diləyirik. Nəfsimizin şərrindən və pis əməllərimizdən qorunmaq üçün yalnız Ona pənah aparırıq. Allah kimə hidayət verərsə, o doğru yolda olar və kimi azdırarsa onu doğru yola yönəldən tapılmaz. Mən şahidlik edirəm ki, Allahdan başqa ibadətə layiq haqq məbud yoxdur, Onun şəriki yoxdur və şahidlik edirəm ki, Məhəmməd ε Onun qulu və elçisidir.

*“Ey iman gətirənlər! Allahdan lazımınca qorxun və ancaq müsəlman olduğunuz halda ölün!”* (Ali-Imran 3:102)

***“Ey insanlar! Sizi tək bir şəxsdən (Adəmdən) xəlq edən, ondan da onun üçün zövcə (Həvvanı) yaradan və onlardan da bir çox kişi və qadın (törədib yer üzünə) yayan Rəbbinizdən qorxun! Adı ilə bir-birinizdən (cürbəcür şeylər) istədiyiniz Allahdan qorxun və qohumluq əlaqələrini kəsməkdən (həzər edin)! Həqiqətən, Allah sizə Nəzarət edəndir!”*** (Nisa, 4:1)

***Ey iman gətirənlər! Allahdan qorxun və doğrü söz söyləyin! (Əgər belə etsəniz) Allah əməllərinizi islah edər və günahlarınızı***

---

[3] Gördüyünüz bu kitab alicənab alim Abdul-Muhsin İbn Naasir Ali-Ubaykanın *əl-Xəvaric vəl Fikrəl Mutəcəddid (Xəvariclər və müasir ideologiyaları)* kitabının tərcüməsidir. Müasir xəvariclərə qarşı təkzib kimi yazılmış bu əsərin son dərəcə möhtəşəm olmasının səbəbi, Şeyx AbdulMuhsinin 1990-cı illərin əvvəllərində qütbçülərlə birgə olması həqiqətidir. Qütbçülər ona təriflər yağdırır, onu müşayiət edir və onun məscidinə kütlə şəklində tez-tez baş çəkirdilər. Allahın izni ilə, şeyx daha sonra *qütbçiliyin* xətərli dəvətini gördükdə həqiqəti tapmış və bunun nəticəsində onları tərk etmişdir. Beləliklə o açıq şəkildə üsyanın və qiyamın başçılarını təkzib etməyə başlamış, “Insan Haqqlarının Müdafiəsi Üzrə Komitə” üzvlərinə onların başçıları Məhəmməd əl-Misariyə dəfələrlə nəsihətlər vermişdir. Ona görə də bu kitab şeyxin həqiqəti başa düşdükdən sonra onu qəbul etməsinə, müdafiəsinə qalxmasına və ediləcək iradlara baxmayaraq haqqı söyləməsinə şahidlik edir.

***bağışlayar. Hər kəs Allaha və Onun elçisinə itaət etsə, böyük bir səadətə nail olar".*** *(Əhzab 33:70-71)*[4].

# XƏVARİC NƏ DEMƏKDIR

*Xəvaric-xaricah* kəlimәsinin cәmidir, bu söz *(ta`ifah)* qrup mənasını verir[5]. Onlar bidətçi bir tayfadırlar və onların peyda olması İslamda ilk baş verən bidət hadisəsidir. Bu hadisə *Sünnə (hədislər)* və *səhabələrin ifadələrində*[6] qınanan bir hadisə kimi tanınmışdır. Onların belə adlandırılmasının səbəbi müsəlmanların ən xeyirlilərinə, *camaata (müsəlmanların ittifaq halında olan birliyi)*, müsəlmanların yekdilliklə seçdikləri həqiqi rəhbərə qarşı qiyam qaldırmalarıdır. Bu üsyankarlıq istər Raşidi xəlifələrə, istərsə də onlardan sonra gəlmiş əməlisaleh şəxsə və ya hər hansı bir rəhbərə qarşı olsun, bunun deyilən adın verilməsində heç bir fərqi yoxdur[7]. Onlara belə bir adın verilməsinin digər səbəbi də onların *camaatın* yolunu tərk etdiklərinə görədir.

Şəhristani demişdir: "Müsəlmanların seçdiyi həqiqi rəhbərlərə qarşı çıxan kəslər varsa, onlar xəvaric (*xarici*) adlandırılmalıdır. Bu

---

[4] *(Bu başlanğıc sözlər **xütbətul hacə** adlanır. Peyğəmbər ε bu sözləri hər dəfə xütbənin əvvəlində dediyi üçün buna - **xütbətul hacə** (ehtiyac xütbəsi) deyilmişdir. qeyd tərcüməçinindir).* Abdullah İbn Məsuddan τ gələn rəvayətdə o demişdir: "Allahın elçisi ε bizə ***xutbətul həcəni*** öyrətdi: Həmd yalnız Allaha məxsusdur..." hədisinin sonuna qədər. İmam Əhməd *Müsnəd* (1/392-393), Tirmizi (№ 1105), Əbu Davud (№2118), ən-Nəsai (№1404) və İbn Macə (№ 1892) rəvayət etmişdir. Tirmizi demişdir: "Abdullahın hədisi *həsən* hədisdir."Əməş onu Əbi İshaqdan, o Əbul Əhvəsdən, o Abdullahdan, Abdullah isə Peyğəmbərdən ε rəvayət etmişdir. Həmçinin Şöbəə, Əbi İshaqdan, o Ubeydəhdən, o Abdullahdan, Abdullah isə Peyğəmərdən ε rəvayət etmişdir. Ona görə də hər iki hədis *səhihdir*. Çünki İsrail hər iki rəvayəti birləşdirmiş və demişdir: "Əbu İshaq, Əbul Əhvəsdən və Əbu Ubeydəhdən, onlar Abdullah İbn Məsuddan, o da Peyğəmbərdən ε rəvayət edir".

[5] Bax. **İbn Həcər** Fəthul-Bari (12/296).

[6] Bax. **Xalid əl-Muslih** Şərhul-`Əqidətil Vaasitiyyə (s.170).

[7] Bax. **İbn Həcər** Fəthul Bari (12/296-316), Nəvəvi Şərh Səhih Muslim (7/170), Şəhristani əl-Miləl və-n Nihəl (s.107), AbdurRəzzaq Afiifi Rəsaail (s.332), Səid İbn Vahf əl-Qahtaani Qadiyyatu-t Təkfiir (s.159).

üsyankarlıq istər Raşidi xəlifələrə, istərsə də onlardan sonra gəlmiş əməlisaleh şəxsə və ya hər hansı bir rəhbərə qarşı olsun, bunun deyilən adın verilməsində heç bir fərqi yoxdur[8].

Bundan başqa onlar müxtəlif adlar, titullar və vəsflərlə tanınmışlar. Bunlardan aşağıdakıları qeyd etmək olar:

Qadı İyad demişdir: "Onlara Peyğəmbərin ε bu: ***"Onlar dindən çıxacaqlar..."***[9] - sözünə görə *Mariqah (dönük, çıxmış)* deyilmişdir. Onlar *əl-Maariqah*[10] adından başqa bütün ad və titullardan məmnun olmuşlar.

Onlar həmçinin *hərurilər* adlandırılmışlar. Çünki onlar Hərura adlanan yerdə üsyan etmişdilər. Bu yer Kufəyə yaxın şəhər adıdır[11]. Həmçinin ən-Nəhrəvan camaatı deyə adlandırılmışlar. Çünki Əli τ orada onlara qarşı vuruşmuşdur[12].

Əli ilə Müaviyə *(Allah onlardan razı olsun!)* sülh bağlamaq üçün münsiflər seçdikdə buna qarşı etiraz edib: *"Hökm yalnız Allaha məxsusdur"* – dediklərinə görə *muhakkimələr* adlandırılmışlar"[13].

Onlar deyirlər ki, böyük günah edən hər kəs kafirdir və əbədi Cəhənnəmdə qalacaqdır. Onlar müsəlmanları etdikləri günahlara görə kafir sayan ilk tayfadırlar. Bidətlərində onlara qarşı çıxanları da təkfir etmiş və rəqiblərinin qanlarını və mallarını halal saymışlar.

Onlar Peyğəmbərə ε, yalnız Allahdan xəbər verdiyi Quran və onu açıqlayan Sünnədə tabe olurlar. Əgər Peyğəmbərin ε buyurduğu Quranın zahiri mənasına müxalif olarsa, onlar Quranın məhz həmin zahiri mənasına əsaslanırlar[14].

---

[8] Bax. əl-Miləl və-n Nihəl (s.105).
[9] Bax. Suyuti Şərh Sunənu-n Nəsai (7/85)
[10] Bax.Şeyx İbrahim ər-Ruheyli Məvqif Əhlu-s Sunnəh vəl Cəməəh (1/137-139)
[11] Bax. Nəvəvi Şərh Sahiih Muslim (7/170) və Xalid əl-Muslih Şərhu-l Əqidəətil Vasitiyyə (s.170)
[12] Bax. Xalid əl-Muslih Şərhu-l Əqidəətil Vasitiyyə (s.170)
[13] Bax. Abul Həsən əl-Əşari *Məqaalaatu-İslamiyyiin (s.207)*
[14] Bax. Şeyx Həmuud ət-Tuveyciri *İthaafu-l Cəməəh (1/274-275)* Şeyx AbdurRəzzaq Əfiifi *ər-Rəsaail (s.332)*

Onlar həmçinin zalım rəhbərə[15] və yaxud vacib Sünnəyə[16] müxalif olan rəhbərə qarşı çıxmağın vacibliyi və ya caiz olması görüşündədirlər.

Onlar özlərini Osman və Əlidən *(Allah onlardan razı olsun!)* uzaq olduqlarını hesab edir və bunu ən üstün ibadət sayırlar[17].

Beləcə bu bidət tərəfdarları günümüzə qədər firqə və ya qruplaşma şəklində qalmaqdadırlar[18].

## BU TAYFANIN İLK DƏFƏ MEYDANA ÇIXMASI

Məzhəbin kökü və ilk meydana çıxması, alicənab Peyğəmbərimizin ε zamanında baş vermişdir. Məzhəbin banisi **Zul Xuveysira ibn Təmim** olmuşdur. Artıq Allahın Elçisi ε onun haqqında belə demişdir: ***"Həqiqətən onun yoldaşları var. Siz öz namazınızı onların namazı ilə, orucunuzu onların orucu ilə müqayisədə aşağı görəcəksiniz. Onlar Quran oxuyurlar, bununla belə Quran onların körpücük sümüyündən aşağı keçməyəcəkdir. Onlar İslamdan - oxun ovlanmış şikardan sıyrılıb çıxdığı kimi çıxacaqlar.***[19]

Bu firqənin başçılarının Osmanın τ qatilləri olmasına baxmayaraq, onların camaatdan ayrılaraq etdikləri ilk üsyan hicrətin 37-ci ilində **Təhkim** hadisəsindən sonra, Əliyə τ qarşı baş vermişdir. Allah daha yaxşı bilir!

---

[15]Bax. Abu Mənsur əl-Bağdadi *əl-Fərq bəynəl firaq (s.17-258)* və İsfaraayiinii *ət-Təbsiir fid-Diin (s.45)*

[16]Bax. Səid İbn Vahf əl-Qahtaani *Qadiyyatu-t Təkfiir (s.159)*

[17]Bax.Şəhristani *əl-Miləl və-n Nihəl (s.115)*

[18] Bax.Şeyx İbrahim ər-Ruheyli *Məvqif Əhlu-s Sunnəh vəl Cəməəh (1/137-139)*

[19]Müslim rəvayət edir. *(№ 1064)*

# BU TAYFANIN MEYDANA ÇIXMASININ SƏBƏBLƏRİ

**Birinci:** İraq camaatı Osmanın τ bəzi qohumlarının həyatından şikayətlənərək onu şərlədilər[20].

**İkinci:** Əli ibn Əbu Talibdən τ ***"Hökm Allaha məxsusdur, insanlara yox"*** sözlərini deməklə ondan buna əməl etməyi tələb etmələri. Əli τ Kufəyə qayıdanda sayları 6, 8 və ya 10 mindən çox olan bir qruplaşma ondan ayrılıb Hərura deyilən yerdə toplaşmışdılar.

**Üçüncü:** Allah təalanın qadağan etdiyi və Peyğəmbərin ε çəkindirdiyi exstremizmə *(həddini aşmağa)* qurşanmaqla böyük günah edənlərin kafir olduğunu demələri. Hətta bəziləri kiçik günah edənin kafir olduğunu da deyirdilər[21].

Əli ibn Əbu Talib τ İbn Abbası τ onlarla danışıq aparmağa göndərdi. Nəticədə, onların çoxu tövbə edib onunla qayıtdılar. Deyilənə görə onların sayı 4 min idi və İbn əl-Kavva da onların arasındaydı[22]. Həmçinin Əli τ də onlarla mübahisə etmiş və onun haqlı olmasını onlar yəqin etdilər.[23]

# XƏVARİCLƏRİN FİRQƏLƏRİ

Xəvariclər çoxlu firqələrə ayrılmışlar. Onların on səkkiz firqə olduqları söylənmişdir [24] . Hətta bəziləri onların sayının iyirmi

---

[20]Bax. İbn Həcər *Fəthu-l Bari (12/296)*
[21]Bax. Şeyx Abdullah Əbu Batii№ *əd-Durarus-Sunniyyəh fil Əcvibətin-Nəcdiyyə (1/360).*
[22] Bax. İbn Həcər *Fəthu-l Bari (12/298)* və İbn Kəsir *əl-Bidəyə və-n Nihəyə (10/567)*
[23] Bax.Şeyx İbrahim ər-Ruheyli *Məvqif Əhlu-s Sunnəh vəl Cəmaəh (1/137)*
[24] Bax. Şeyxul İslam İbn Teymiyyə *Minhəcu-s-Sunnəh (5/11)*

olduğunu ehtimal edirlər[25]. Onların ən böyükləri *əl-Muhakkimə, əl-Əzəriqah, ən-Nəcdət, əl-Bəhisiyyəh, əl-Acaridəh, əs-Səalibəh, əl-İbadiyyə və əs-Səfəriyyə*-dir. Qalanları isə bu firqələrin qollarıdır[26].

# FİRQƏNİN BAŞÇILARI

Xəvariclərin ilk əsas firqəsi, möminlərin əmiri Əli τ, Müaviyə τ ilə sülh bağlamaq üçün iki hakim təyin etdiyi zaman ona qarşı çıxan birinci muhakkimələrdir. Onlar Kufə yaxınlığında yerləşən Harura adlı yerdə toplandılar və onların rəhbərləri Abdullah ibn əl-Kavva əl-Yəşkuri ət-Təmimi, İtab ibnul Əvar, Abdullah ibn Vahb ər-Rasibi, Urva ibn Hudeyr, Yezid ibn Əbi Asim əl-Muharibi və Zis-sədiyyə ləqəbi ilə tanınmış Hərqus İbn Zuheyr idi[27].

Onların arasında həmçinin sübh namazında Əlini τ qətlə yetirən Abdurrahmən İbn Mülcəm də var idi.

İraqdakı xəvariclərin başçısı Nafi ibn əl-Əzrəq, Əliyə τ qarşı üsyanda ən şiddətli sayılan Yəməmədəkilərin başçısı Nəcdəh ibn Amir, əl-Əşəs ibn Qeys, Misar ibn Fədəki ət-Təmimi və Zeyd ibn Hüseyn ət-Tai idi[28].

# BU FİRQƏ HAQQINDA YAZILAN BƏZİ ƏSƏRLƏR

Xəvaric firqəsi haqda yazılan əsərlərdən aşağıdakıları qeyd etmək olar:

---

[25] Bax. Əbu Mənsur əl-Bağdadi *əl-Fərqu bəynəl firaq (s.54)* və İsfərayini *ət-Təbsir fid-Din (s.45)*

[26] Bax.Şeyx İbrahim ər-Ruheyli *Məvqif Əhlu-s Sunnəh vəl Cəməəh (1/137)*

[27] Bax. Şəhristani *əl-Miləl və-n Nihəl (s 107-115)*

[28] Bax. İbn Həcər *Fəthu-l Bari (12/296)*, Şeyx AbdurRəzzaq Əfifi *ər-Rəsail (s.332)və* Şəhristani *əl-Miləl və-n Nihəl (s.106)*

- Əbu Mixnəf, Lut ibn Yəhya; İmam ət-Təbəri *Tarix* əsərində onun kitabının müxtəsərini vermişdir.
- Əl-Heysəm İbn Adiyy.
- Buxarinin *Səhihindən* başqa bütün kitablarında onun şeyxi sayılan Muhəmməd İbn Qudamə əl-Cövhəri. O bu haqda geniş bir kitab yazmışdır.
- Əbul Abbas İbn əl-Mubarrad *əl-Kamil* kitabında onlara aid rəvayətləri toplamışdır. Bununla belə, ondan əvvəl adını qeyd etdiyimiz müəlliflərin əksinə olaraq rəvayətləri isnadsız yazmışdır.[29]
- Əbul Fəth Muhəmməd İbn Abdul Kərim əş-Şəhristaninin *əl-Miləl və-n Nihəl* kitabı.
- Əbu Mənsur Abdul Qahir əl-Bağdadinin *əl-Fərq bəynəl Firaq* kitabı.

---

[29] Bax. İbn Həcər *Fəthu-l Bari (12/297)*

# ƏHLİ SÜNNƏ VƏ CAMAATIN XƏVARİC FİRQƏSİNƏ MÜNASİBƏTİ

*Əhli Sünnə və camaatın* etiqadına görə xəvaricilər müsəlmanların birliyini pozan batil və bidətçi firqədirlər.

Xəvariclərin *təkfir olunması* ilə əlaqədar alimlərin iki məşhur rəyi vardır[30]. Düzgün rəy onların kafir olmamasını deyən rəydir[31]. Səhabələr onlara qarşı vuruşmaq fikrində yekdil olsalar da onlara kafir deməmişlər[32]. Xəvariclər nahaq qan tökməyincə və müsəlmanların mallarına əl qoymayınca səhabələr onlarla vuruşmadılar. Onlara qarşı döyüşməkdə məqsəd onların kafir olması deyildi, sadəcə olaraq onların zülmünün qarşısını almaq idi. Bu səbəbdən, səhabələr xəvariclərin qadınlarının şərəfinə toxunmur, mallarını da qənimət götürmürdülər[33].

Səhabələrin *Xəvarictləri* kafir görməməsinin sübutu onların arxasında namaz qılmaları idi. Abdullah ibn Ömər *(radiyallahu anhu)* və digər səhabələr Nəcdəh əl-Hərurinin arxasında namaz qılardılar. Onlara hədis rəvayət edər, fətva verər və sıravi bir müsəlmanın digər müsəlmanla danışdığı kimi onlarla danışardılar. Buna misal Buxarinin rəvayət etdiyi kimi Nəcdə əl-Hərurinin bəzi məsələləri soruşanda Abdullah İbn Abbasın τ ona cavab verməsidir. Eynilə, məşhur məsələlərlə əlaqədar Nafi ibn əl-Əzrəqə cavab vermiş və iki müsəlmanın mübahisə etdiyi kimi Qurandakı məsələləri də onunla müzakirə etmişdir.

---

[30] Bax. əs-Suyuti *Şərhun-Nəsə`i* (7/85).
[31] Bax. Nəvəvi *Şərh Səhih Muslim* (7/170), İbn Teymiyyə *Minhəcus Sunnə* (5/248), Munəəvi *Faydul Qadir* (3/50) və *Durarus Səniyyə* (9/290).
[32] Bax . İbn Teymiyyə *Minhəcus Sunnə* (5/248)
[33] Bax. Zeyd İbn Fayad *ər-Ravdatun Nadiyya-Şarhil Vasitiyya (s.392)*

Xəvariclər müsəlmanları mürtəd adlandırana qədər müsəlmanlar onlarla bu cür davranırdılar[34]. Peyğəmbər ε onları İslamdan çıxarmamış, əksinə onları müsəlman saymış və onların cəhənnəmdə əbədi qalacaqlarını söyləməmişdir. Bax bu böyük qaydadır və bunun nəzərə alınması çox əhəmiyyətlidir.

Ona görə də hər əsrdə rəhbərlər müsəlmanların başçılarının itaətindən çıxanlara qarşı mübarizə aparmış, alimlər də onlarla birgə mübarizəyə qoşulmuş və bu məsələdə onları ruhlandırmışlar. Alimlər bu mübarizə və bunu həyata keçirən kəslərin özəlliklərinə dair kitablar yazmışlar. Ona görə bu işə qoşulan şəxsdə buna dair heç bir şəkk-şübhə qalmamışdır[35].

Elm adamlarına görə bu mənfur məzhəb meydana çıxarsa, müsəlmanlar ilk növbədə onları Allah yoluna dəvət etməklə və insanları bu haqda maarifləndirməklə müalicə etməlidirlər.[36]

## Mühazirə

Həmd[37] aləmlərin Rəbbi Allaha məxsusdur. Peyğəmbərlərin sonuncusu, elçilərin başçısı, imamımız Muhəmmədə, onun ailəsinə, bütün səhabələrinə və Qiyamət gününə qədər yaxşı işlərdə onlara tabe olanlara salavat və salam olsun.

Tərifəlayiq və Uca Allahın yoluna dəvət edən insanın öyrənməsi münasib olan ən mühüm mövzulardan biri də müsəlmanların indiki və gələcək vəziyyətləri üçün əhəmiyyətli olan məsələlərin öyrənilməsidir. Xüsusilə də ixtilafların, münaqişələrin və

---

[34] Bax . İbn Teymiyyə *Minhəccus Sunnə* (5/248)
[35] Bax. *Durarus Səniyyə* (9/290)
[36] Bax. Şeyx Saleh Fovzan *Ləmhatun Anil Firaqid Dalləh* (s.42)
[37] Buradan etibarən kitabın əsaslandığı Şeyxin əsas mühazirəsi başlayır. Əvvəlki bölmə korrektor Cabir İbn Əli əl-Marri tərəfindən əlavə olunmuş ön sözün müxtəsər hissəsi idi.

*“Haqq mənimlədir”* deyənlərin çoxaldığı bu əsrdə bugünkü mühazirənin mövzusu çox əhəmiyyətlidir.

Təkfir məsələsində zəlalətə düşən və ya təkfir etməklə məşhurlaşan firqənin *xəvariclər* olduğunu çox insan bilir. Bəzi insanlar Peyğəmbərin ε hədisdə qeyd etdiyi *xəvariclərin* yalnız o zaman Əli ibn Əbu Talibə τ qarşı üsyan edən və onun ağır döyüşlərdən sonra məğlub etdiyi xəvariclər olduğunu zənn edir və bundan sonra xəvariclərin tükəndiklərini düşünürlər.

Bununla belə bir az keçmədi ki, xəvariclərin prinsiplərinə o qədər də sadiq qalmayan və bir növ onlara oxşayan bir firqə meydana çıxdı. Inşallah Uca Allahın izni ilə açıqlamaq istədiyimiz də budur.

# Giriş

Həqiqətən Uca Allah öz peyğəmbəri Muhəmmədi ε kamil, asan, əhatəli və bəndələr üçün faydalı olan şəriət ilə göndərmişdir. Sonra Peyğəmbər ε Mədinədə İslam dövlətini möhkəmləndirdi, şəriət məsələləri öz yerini tutdu, müsəlmanları bir əsas və məzhəb üzərində birləşdirdi. Onların arasında, əvvəlki zamanların ixtilaflarından qalan kiçik məsələlər istisna olmaqla, heç bir fikir ayrılığı yox idi. Bu kiçik məsələlərin həllində elm adamları üçün ictihad etmək və sərbəst fikir yürütməyə geniş yer vardır. Hər halda Müctəhidin savab qazanmaqda payı vardır. Peyğəmbər ε buyurmuşdur: Hakim hökm verərkən ictihad edərək düzgün nəticəyə gələrsə, ona iki savab, xata edərsə bir savab vardır[38]. İctihad edilməsi qadağan olunan məsələlər əqidə *(etiqad)* və mənhəc *(metodologiya)* məsələləridir. Nə Peyğəmbərin ε dövründə səhabələr arasında, nə də Əbu Bəkr və Ömər *(Allah onlardan razı olsun!)* dövründə bu iki məsələdə heç bir fikir ayrılığı

[38] Buxari *(№7352)* və Muslim *(№1716)* rəvayət etmişdir

baş verməmişdir. Həqiqətən səhabələr vahid əqidə və mənhəcə *(metoda)* malikdilər.

Daha sonra isə ixtilaf və parçalanma ilə əlaqədar bəzi hallar baş verdi. Peyğəmbər ε isə öz vaxtında ümmətini asanlaşdırmağa həvəsləndirmiş, çətinləşdirməkdən çəkindirmiş, mülayim davranmağı əmr etmişdi. Cərir İbn Abdullahdan *τ* gələn hədisdə deyilir: "Mən Allahın Elçisinin ε belə dediyini eşitdim: ***"Kim mülayimlikdən məhrumdursa bütün xeyirlərdən də məhrumdur."***[39] Muslim və Əbu Davud rəvayət etmişdir, lakin Muslimdə *"bütün"* sözü yoxdur.

Əbu Darda τ Peyğəmbərin ε belə dediyini rəvayət etmişdir: **"Kimə mülayimlikdən payı verilmişdirsə, o halda ona xeyirdən olan payı verilmişdir. Kimə ki, mülayimlikdən payı verilməmişdirsə, o xeyirdən olan payından məhrum edilmişdir"**[40]. Hədis Tirmizi və başqaları tərəfindən rəvayət olunmuşdur.

Əbu Musa əl-Əşarinin *τ* belə dediyi rəvayət olunmuşdur: "Allahın Rəsulu ε səhabələrindən birini hər hansı bir iş dalınca göndərdikdə, onlara belə əmr edərdi: ***"İnsanları müjdələyin, qaçırmayın, asanlaşdırın, çətinləşdirməyin"***[41]. Buxari və Muslim Əbu Musanın hədisindən rəvayət etmişlər.

Peyğəmbər *(sallallahu aleyhi və salləm)* demişdir: ***"Dində həddinizi aşmaqdan çəkinin"***[42]. Xəvariclərin zəlalətə düşməsinə və haqq yoldan

---

[39] Muslim *(№2592)* və Əbu Davud *(№4809)* rəvayət etmişdir.

[40] **Səhih li ğeyrihi:** İmam Əhməd *Müsnəd* əsərində rəvayət etmişdir *(6/451)*, Tirmizi *(№2013)* demişdir: "Bu hədis *həsən səhihdir."* Həmçinin Humeydi Müsnədində *(№393)* və İbn Əbi Şeybə *Müsənnəf (№25296)*, Buxari *Ədəbul Mufrəd (№361)* və Beyhaqi *Sunanul Kubra (10/193)* və *Şuabul İman (№8002)* əsərində rəvayət etmişlər. Heysəmi *Məcməuz Zavaiddə (8/153)* deyir: "Əhməd bunu rəvayət etmişdir və rəvayətçiləri etibarlıdır".

[41] Buxari *(1/196)* və Muslim *(№1734)* rəvayət etmişlər.

[42] **Səhih**: İmam Əhməd *Müsnəd (1/347)*, Nəsai *əl-Müctəbə (№3057)*, İbn Macə *(№3029)*, Fakihi *Əxbaar Məkkə (№2639)*, İbn Əbi Şeybə *Müsənnəf (№13907)*, İbn Əbi Asim *Sunnə (№98)*, İbn Xuzeymə *Səhih (№2867)*, İbn Hibban *Səhih (№3860)*, Tabarani *Mucamu`l Kəbir (12/121)*, Hakim *Müstədrək (№1711)* və Beyhəqi

azmasına səbəb məhz həddini aşmaq xisləti olmuşdur. Onlar hədlərini aşdılarına görə haqq yoldan azdılar. Ona görə də Peyğəmbər *(sallallahu aleyhi və səlləm)* buyurmuşdur: ***“Onlar Dindən oxun ovlanmış şikardan çıxdığı kimi çıxacaqlar”***[43]**.** Yəni, kimsə ova ox atdıqda, ona dəyərsə, o, şikarın bir tərəfindən batıb digər tərəfindən çıxar. Peyğəmbər *(sallallahu aleyhi və səlləm)* də onları atılan oxa bənzətmişdir. Elə bil ki, onlar İslama tez daxil olmuş və oxun ovun digər tərəfindən çıxdığı kimi İslamdan çıxmış olurlar.

Peyğəmbər *(sallallahu aleyhi və səlləm)* buyurmuşdur: ***“Dində həddinizi aşmaqdan çəkinin, çünki bu sizdən əvvəlkiləri həlak etmişdir”***[44]. Yəni, həddinizi aşmaqdan qorunun, çünki əvvəlki ümmətlər dində həddini aşdılar və zahid həyatı sürdülər, Uca Allahın onlara vacib etmədiyi şeyləri özlərinə vacib etdilər və Allah da onlara qarşı tələbkarlığını artırdı. Bu məsələnin təfsilatına getməyəcəyik, çünki mövzu böyükdür. Peyğəmbər *(sallallahu aleyhi və səlləm)* buyurmuşdur: ***“Çünki o (həddini aşmaq) sizdən əvvəlkiləri həlak etdi. Onların qanlarını tökməyə və qadınlarını halal görməyə vadar etdi”*** [45] . Həmçinin Peyğəmbər *(sallallahu aleyhi və səlləm)* belə buyurmuşdur: ***“Həqiqətən də bu din güclüdür. Ona görə dinin içində***

---

*Sunanu`l Kubra (№9534).* İbn Xuzeymə, İbn Hibban, Zəhəbi, Nəvəvi *Məcmusunda (8/171)* və Şeyxul İslam İbn Teymiyyə *Məcmuul Fətavada (3/383)* hədisin səhih olduğunu bildirmişlər.

[43] Buxari *(№5058)* və Muslim *(№1064)* rəvayət etmişdir.

[44] **Səhih:** İmam Əhməd *əl-Müsnəd (1/347),* Nəsai *əl-Muctaba (№3057),* İbn Macə *(№3029)*, Fakihi *Axbar Makka (№2639)*, İbn Əbi Şeybə *Müsənnəf (№13907)*, İbn Əbi Asim *əs-Sunnə (№98),* İbn Xuzeymə *Səhih (№2867),*İbn Hibban *Səhih (№3860),*Tabarani *Mucamu`l Kabir (12/212)*, Hakim *Mustədrək (№1711),* Beyhəqi *Sunanul Kubra (№9534).* İbn Xuzeymə, İbn Hibban, Hakim, Zəhəbi, Nəvəvi *Məcmusunda (8/171)* və Şeyxul İslam İbn Teymiyyə *Məcmuu`l Fətavada (3/383)* hədisin səhih olduğunu bildirmişdir.

[45]Müslim rəvayət etmişdir (№2578)

***diqqətlə irəlilə. Çünki, yükünü ağır edən çox uzağa getməz miniyini də həlak edər."***[46]

Peyğəmbər *(sallallahu aleyhi və səlləm)* müsəlman camaatla bir yerdə olmağı əmr etmiş, parçalanmağı və üsyankarlıq etməyi qadağan etmişdir. Camaatı qoyun sürüsü ilə müqayisə etmiş, camaatdan ayrılmış kimsəni isə sürüdən ayrılmaqla qurda yem olmuş qoyuna bənzətmişdir.

Ona görə də Peyğəmbər *(sallallahu aleyhi və səlləm)* buyurmuşdur: ***"Qurd, sürüdən azmış qoyunu yeyir"***[47]. Amma heç kəs birlikdə olan camaata qalib gələ bilməz. Camaatdan ayrılmış azsaylı bir dəstə üzərində düşmənin qələbə çalması isə daha çox ehtimal edilir. Abdullah İbn Ömərin *(Allah ondan razı olsun!)* belə dediyi rəvayət olunmuşdur: "Ömər *(Allah ondan razı olsun!)* bizə əl-Cəbiyə[48] adlı yerdə müraciət edərək buyurdu: "Ey insanlar! Mən sizin aranızda Allahın Elçisinin *(sallallahu aleyhi və səlləm)* bizim aramızda, bizə müraciət etdiyi kimi müraciət edirəm: ***"Sizə səhabələrimin, sonra onların ardınca gələnlərin, sonra da onların ardınca gələnlərin yoluyla getməyi***

---

[46] **Zəif:** İmam Əhməd *(3/199)*, Beyhaqi *Sunanul Kubra (№4743) və Şuabul İman (№3885).* Suyuti *Caamius Sağirdə (№2509)*səhihliyinə istinad etmişdir və Albani *Sahihul Camidə (№2446)Ənəsin hədisindən* hədisi *həsən* elan etmişdir. Əl-İcluni *Kəşful Xəfa kitabında (2/217) deyir:* "Hədisin *tam və yaxud mürsəl* olduğu haqqında ixtilaf var. Buxari *Tarixində* düzgün mövqe tutmuşdur və hədis *mürsəldir*. İraqi *əl-Muğni`an Hamlil Asfar kitabında (№1232) deyir:* "Cabirin hədisindən Beyhaqiyə görə isnadı *səhih* deyil". Mən isə deyirəm: "Cabir yolu il gələn hədis Albani tərəfindən, *Da`iiful Caami (№2022)* və *Silsilatud-Da`ifada (№2480)* olduğu kimi *zəif* elan edilmişdir.

[47] **Həsən Səhih:** İmam Əhməd *əl-Müsnəd (5/196),*Əbu Davud *(№547),* Nəsai *əl-Muctaba (№846),*İbn Xuzeymə *Səhih (№1486),*İbn Hibban *Səhih (№2098),* Hakim *Mustədrək (1/211),* Beyhəqi *Sunanul Kubra (№4929) və Suğra (№494),Şuabul İman (№2859) və* Bəğəvi *Şərhus Sunnə (№794).* İbn Xuzeymə, İbn Hibban, Hakim, Zəhəbi və Nəvəvi *Xulasatul Əhkamda (№784)* hədisin səhih olduğunu bildirmişdir. Suyuti *Camius Sağirdə (№8017)* hədisin səhihliyinə istinad etmişdir. Albani hədisin *həsən səhih* olduğunu bildirmişdir.

[48] Yaqut əl-Hamavi *Mucamul Buldaan* əsərində *(2/106)* bildirmişdir: "Bu məkan Dəməşqin kənarında şəhərdir".

***tövsiyə edirəm. Bundan sonra yalan geniş yayılacaqdır. Hətta bir kəsin*** *(Allahın adından yalan danışdığı üçün)* ***and içməsi istənilmədiyi halda, o and içəcək,*** *(Yalançı olduğuna görə)* ***şahidlik etməsi tələb olunmadığı halda şahidlik edəcəkdir. Bir kişi başqa*** *(naməhrəm)* ***bir qadınla tək-tənha qalmasın. Yoxsa onların üçüncüsü şeytan olar. Camaatdan möhkəm yapışın, parçalanmaqdan çəkinin. Çünki şeytan tənha kimsəylədir və iki nəfərdən bir az uzaqdır. Kim Cənnətin gözəlliyini istəyirsə camaatdan yapışsın. Kim öz yaxşı əməllərindən razı, pis əməllərindən narahatdırsa, o, mömindir"***[49]**.**

Peyğəmbər *(sallallahu aleyhi və səlləm)* camaat olmağı əmr etdiyi kimi, parçalanmağı və ixtilafa düşməyi də qadağan edərək buyurmuşdur: ***"Sizdən əvvəlkilər həddindən artıq çox sual vermək və peyğəmbərlərinə qarşı etiraz etdiklərinə görə həlak oldular"***[50]**.** Digər hədisdə isə Allahın Elçisi *(sallallahu aleyhi və səlləm)* belə buyurmuşdur: ***"Həqiqətən bu ümmət yetmiş üç firqəyə parçalanacaqdır. Onlardan biri istisna olmaqla hamısı Cəhənnəmdə olacaqdır"***[51]**.**

---

[49] **Səhih:** İmam Əhməd Müsnəd *(1/18)*, Tirmizi *(№2165)*, İbn Macə *(№2363)*, AbdurRəzzaq Müsənnəf *(20710)*, Humeydi Müsnəd *(1/19-20)*, İbn Əbi Asim Əs-Sunnə *(№88)*, İbn Hibban Səhih *(№4557)*, Təbərani Mucamul Avsat *(№7249)* və Mucamul Sağir *(1/89)*, İbn Mandah əl-İman *(№1087)*, Hakim Mustədrək *(№387)* və Əl-Beyhaqi Sunanul Kubra *(7/91)*. İbn Hibban və əl-Hakim hədisi səhih saymış və demişlər: Bu hədis Şeyxeynin (Buxari-Müslim) şərtləri üzrədir". əz-Zəhəbi onlarla razılaşmışdır. Və Suyuti Camius Sağirdə *(№2795)* hədisin səhihliyinə istinad etmişdir. Həmçinin Albani və Əhməd Şakir hədisi səhihləşdirmişdir.

[50] Buxari *(№7288)* və Müslim *(№1337)*

[51] **Həsən Səhih:** İmam Əhməd Müsnəd *(2/332)*, Tirmizi *(№2640)*, Əbu Davud *(№4596)*, İbn Macə *(№3991)*, Abdurrəzzaq Müsənnəf *(18675)*, əd-Darimi *(№2514)*, İbn Əbi Asim əs-Sunnə *(№2)*, əl-Bəzzaar Müsnəd *(№2755)*, İbn Hibban Səhih *(№2647)*, ət-Təbarani Mucamul Kəbir *(№8051)* və Mucamul Avsat *(№4886)* və Mucamus Sağir *(1/256)*, əl-Acurri əş-Şəriəh *(1\126)*, əl-Hakim Mustədrək *(4/430)*, əl-Lalikayi Şarh Usuli İtiqad *(1/100)* və əl-Beyhaqi Sunanul Kubra *(10/208)*. Hədis məşhurdur, çox yollarla rəvayət edilmişdir. İbn Hibban və Hakim hədisi səhihləşdirmiş və demişlər: "Hədis Müslimin şərtinə uyğundur". Əz-Zəhəbi də onunla razılaşmışdır. Şatibi *İtisam (2/699)* əsərində hədisi səhihləşdirmişdir və Suyuti *Camius Sağir* əsərində *(№1223)* hədisin səhihliyinə istinad etmişdir. Şeyxul

Eynilə Peyğəmbər *(sallallahu aleyhi və salləm)* müsəlmanların başçısına beyət *(sədaqət andı)* etməyi əmr etmiş və buyurmuşdur: ***"Kim "onun boynuna beyət düşmür" - deyərək ölərsə, o cahiliyyə ölümü ilə ölər"*** [52] . Bəzi insanlar bu məsələdə zəlalətə düşərək belə düşünürlər ki, onların boynunda beyət yoxdur. Çünki onlar fərdi olaraq hakimin yanına gedib, onun əlini sıxıb ona beyət etməmişlər. Bu isə cəfəng bir xətadır. Çünki səhabələr *(Allah onlardan razı olsun!)* Əbu Bəkrə *(Allah ondan razı olsun!)* beyət edəndə müsəlmanların hamısı fərdi şəkildə beyət etmək üçün onun yanına getmədilər. Onların içərisindən yalnız ixtiyar sahibləri beyət aldılar, bununla belə beyət təsdiq olundu və Əbu Bəkrin *(radiyallahu anhu)* yanına fərdi şəkildə gəlməyən hər kəsin beyəti bərqərar olundu; onlar nə Əbu Bəkri *(radiyallahu anhu)* gördülər, nə də onun zahirinə baxdılar. Bu da müsəlmanların hər zaman və hər yerdə gəldikləri yekdil rəydir. Bununla belə hər kəsin fərdi şəkildə beyət etməsinin vacib olduğunu və əks təqdirdə onun beyətinin olmadığını demək düzgün deyildir. İxtiyar sahibləri beyət *(hüququ)* almış, xilafət, səlahiyyət və ya rəhbərlik bərqərar olmuşdursa artıq beyət də onlara vacib sayılır. Onu rəhbər qəbul etmədən, gecəsini keçirmək həmin şəxsə halal deyil. Ona görə də, bunu yerinə yetirmədən hətta bir gecə keçirmək belə düzgün deyildir. O, bu əməli ilə cahillik dövrünün ölümü ilə ölərək özünü məhv etmiş olar. Belə şər əməldən Allaha sığınırıq.

---

İslam İbn Teymiyyə Məcmuul Fətavada *(3/345)* demişdir: "Hədis səhihdir, sünən və məsəniddə *(Yəni, müxtəlif hədis kitablarında)* məşhurdur" İbn Kəsir Təfsirində *(2/604)* demişdir: "Hədis *sunan və məsəniddə* müxtəlif yollarla gəlir və bir birini gücləndirir". Əhməd Şakir hədisin isnadının səhih, Albani də hədisin həsənun səhih olduğunu demişdir.

[52] Bu hədisi Müslim *(№1815)* öz isnadı ilə İbn Ömərdən rəvayət etmişdir. İbn Ömər demişdir: "Mən Allah Elçiunun *(sallallahu aleyhi və salləm)* belə buyurduğunu eşitdim: **"Kim əlini itaətdən uzaqlaşdırarsa *(rəhbərə itaət etməzsə)*, Qiyamət Günü Allahın qarşısında heç bir əsası olmaz. Və kim ki, boynunda beyət olmadan ölərsə, o cahiliyyə ölümü kimi ölər".**

Peyğəmbər *(sallallahu aleyhi və səlləm)* müsəlmanların rəhbərinə itaət etməyi əmr etmiş, Əzəmətli və Uca Rəbbimiz də bunu açıq aydın vəhyində açıqlayaraq buyurmuşdur:

***"Ey iman gətirənlər! Allaha, Peyğəmbərə və özünüzdən olan ixtiyar sahiblərinə itaət edin".*** *(ən-Nisa :59)*

Allah təala ilk olaraq Özünə, sonra Elçisinə, daha sonra isə asilik olmayan mübah işləri, itaəti buyuran əmirlərə müti olmağı əmr etmişdir. Buna görə, əgər onlar asilik *(Allahın buyurduqlarına zidd)* olmayan bir şeyi əmr edirlərsə, müsəlmanların ona itaət etməsi vacibdir. Heç kəsin: **"Mən onlara yalnız Allaha itaət olan məsələlərdə itaət edəcəyəm"** - deməsi düzgün deyildir. Çünki Allahın Elçisi *(sallallahu aleyhi və səlləm)* yalnız Allaha asiliyi əmr edən rəhbərlərə itaət etməməyi buyurmuşdur. Allahın Elçisinin *(sallallahu aleyhi və səlləm)* sözündən çıxan nıticəyə görə, onlar Allahın buyurduqlarına zidd olmayan bir şeyi əmr etdikdə müsəlmanların ona itaət etməsi və onu dinləməsi vacibdir. Bu, Allahın buyurduqlarına zidd olmayan məsələlərdə aydın görünür. Buna misal olaraq yol hərəkət qaydaları və ona bənzər məsələləri qeyd etmək olar. Əsas odur ki, belə məsələlər Allahın buyurduqlarına zidd olmasın. Rəhbər, ümümi məqsəd və mənfəətlərin təşkili üçün insanlara bu cür əməlləri vacib edə bilər və belə halda ona itaət etmək vacibdir. Əgər bu işlərdə rəhbərə itaətsizlik edilərsə cəmiyyətdə özbaşnalıq artar və sabitlik pozular. Ona görə Peyğəmbər *(sallallahu aleyhi və səlləm)* buyurmuşdur: ***"Kim mənə itaət edərsə, Allaha itaət etmiş olar. Kim mənə asi olarsa, Allaha asilik etmiş olar. Kim rəhbərə itaət edərsə, mənə itaət etmiş olar. Kim də rəhbərə asi olarsa mənə asi olar"***[53]**.** Bu məsələyə dair dəlillər çoxdur. Bununla yanaşı, mövzunu uzatmaq niyyətimiz yoxdur. Mən artıq bu məsələni

---

[53] Buxari *(№2957)* və Müslim (№1835)

***"Rəhbər və itaətkarların hüquqları"***[54] adlı əsərimdə daha geniş açıqlamışam.

Eynilə, Peyğəmbər *(sallallahu aleyhi və salləm)* müsəlmanların birliyini dağıtmaq, hərc-mərclik və qeyri-sabitlik yaratmaq üçün gələn şəxsə qarşı mübarizə aparmağı əmr etmişdir.

Hətta *(rəhbərlikdə iddialı olan)* ikinci şəxs birincidən daha yaxşı olsa da birincini tərk edib ikincini dəstəkləmək qadağandır. Çünki, müsəlmanların məsələləri bir nəfər tərəfindən nizama salınıbsa, başqa birinin gəlib əvvəlkini rüsvay etməsinə icazə vermək insanlar arasında hərc-mərclik və nahaq qan axıtmağa səbəb olmaqdır. Beləliklə, o, müsəlmanların vahid camaatının işlərini korlayar, qan tökər, insanların şərəfini təhqir edər və böyük fitnə-fəsad salar. Şəriətdə öz təsdiqini tapmış qaydalardan birinə görə: ***"Özündən daha böyük zərərin qarşısının alınması üçün kiçik zərərə icazə verilə bilər"***[55]**.**

# XƏVARİC FİRQƏSİNİN MEYDANA ÇIXMASI

Xəvariclər, müsəlmanlar arasında parçalanma olan bir zamanda meydana çıxdılar. Bunun təsdiqi olaraq Peyğəmbər *(sallallahu aleyhi və salləm)* onlardan xəbər verərək əvvəlcədən buyurmuşdur: ***"...Onlar müsəlmanlar arasında parçalanma olduğu zaman meydana çıxacaqlar"***[56]**.**

---

[54] Şeyx tərəfindən verilən mühazirənin adı.

[55] Bax. İbn Rəcəb *Qavaiid (2/463)*, İbn Nəcim *əl-Əşbəəh vən Nəzaair (s.98)*, Suyuti *əl-Əşbəəh vən Nəzaair (1/124)*, İbnul Qeyyim *Miftəh Darus Sə`adəh (3/365)*, Sədi *Şərh Mənzuməətul Qavaidil Fiqhiyyə (s.14)*, əz-Zərqaa *Şərhul Qavaidul Fiqhiyyə (s.201)*. Sədlan *əl-Qəvaidul Fiqhiyyə (s.527)*.

[56] Buxari *(№3610)* və Müslim *(№1064)* rəvayət etmişdir.

Zeyd İbn Vahb əl-Cuhanidən[57]gələn rəvayətdə o özünün Əli (*radiyallahu anhu)* ilə xəvariclərin yanına gedən qoşunun içində olduğunu deyir. Əli *(radiyallahu anhu)* deyirdi: "Ey insanlar! Mən Allahın Elçisinin *(sallallahu aleyhi və səlləm)* belə dediyini eşitdim: ***"Ümmətimdən Quran oxuyan insanlar meydana çıxacaqdır. Sizin Quran oxumağınız onların Quran oxumağı, namazınız onların namazı və orucunuz onların orucu ilə müqayisədə çox az olacaqdır. Onlar Quran oxuyacaq, Quranın onların lehində olacağını düşünəcəklər. Amma Quran onların əleyhinə olacaq, Namaz boğazlarından aşağı keçməyəcək[58], İslamdan oxun ovlanmış şikardan çıxdığı kimi[59] çıxacaqlar.*** **Onlarla *(döyüş meydanında)* görüşən ordu Peyğəmbərin *(sallallahu aleyhi və səlləm)* dili ilə onlara zəmanət veriləni *(müjdəni)* bilsəydi, bu əmələ arxayınlaşıb digər saleh əməlləri etməzdilər. Onların *(xəvariclərin)* fərqli əlaməti odur ki, onların arasında yuxarı qolu olan lakin dirsəyi olmayan bir kişi olacaqdır.".** Siz Müaviyənin və Şam camaatının yanına gedərək bunları *(xəvaricləri)* öz uşaqlarınız və sərvətiniz yanında arxada buraxırsınız! Allaha and olsun, bunlar *(xəvariclər)*, haram qanı tökmüş, insanların mal-qarasına[60] hücum etmiş kimsələrdir. Ona görə Allahın adı ilə *(onlara qarşı döyüşə)* irəliləyin".

---

[57] əz-Zəhəbi Siyar A`ləmun Nubala *(4/196)* əsərində demişdir, "Zeyd İbn Vahb əl-Cuhani əl-Kufi, Peyğəmbər *(sallallahu aleyhi və səlləm)* ilə görüşmək üçün gedən qoca kişi idi. Amma Zeyd yolda olarkən Peyğəmbər *(sallallahu aleyhi və səlləm)* dünyasını dəyişmişdi. Zeyd hicrətin 83-cü ilin axırlarına doğru dünyasını dəyişmişdir".

[58] İbn Həcər Fəthul Bari əsərində *(12/293)* demişdir: "Bu çiyinlə boyun arasında olan sümükdür."

[59] İbn Əsir ən-Nihəyə əsərində *(4/320)* demişdir: "Ovlanan şeyə atılan oxun onu deşməsi və sonra da ondan çıxması kimi, onlar da İslama girəcək, ondan keçəcək və İslamı tərk edəcəklər". əz-Zaari Muxtarus Sihaah *(1/259)* əsərində demişdir: "Ox ovlanmış ova girəndə, girdiyi yerin əksinə olaraq digər tərəfdən çıxır. Ona görə də Xəvariclərə Peyğəmbərin *(sallallahu aleyhi və səlləm)* aşağıdakı hədisi səbəbi ilə *Mariqa (çıxan)* deyilmişdir: "Ox ovlanmış oxdan keçib çıxdığı kimi onlar da İslamdan keçib çıxacaqlar. *Mariqa*-nın cəmi *Murraq*-dır.

[60] Azim Abadi Avnul Məbud əsərində demişdir *(12/83)*: "Yəni, onların çöldə ötlayan buynuzlu mal-qarası"

Sələmə ibn Kuheyl[61] deyir: "Zeyd ibn Vahb *(yolumuz boyu endiyimiz)* bir mənzildə mənə belə dedi: Həmin *(xəvariclərə qarşı döyüşdüyümüz)* gün *(o yerdəki)* körpüyə[62] çatanda Abdullah ibn Vahb ər-Rasibi[63] onlara başçılıq edirdi. Abdullah İbn Vahb onlara dedi: "Nizələrinizi atın və qılınclarınızı qınından çıxarın. Çünki mən qorxuram ki, onlar Hərura[64] günü sizə hücum etdikləri kimi yenə hücum edəcəklər". Onlar geri çəkilib nizələrini kənardan qarşı tərəfin üzərinə[65] atıb qılınclarını çıxardılar. *(Əlinin qoşununda olan)* adamlar onlara qarşı nizələrlə hərəkət edib nizələri onlara batırdılar və bir-birinin ardınca onları öldürdülər. Həmin gün *(Əlinin qoşununda olan)* insanlar arasında yalnız iki nəfər ölmüşdü. Əli *(radiyallahu anhu)* dedi: "onların arasında muxdacı *(şikəst adamı)*[66] axtarın. Onlar axtardılar lakin onu tapmadılar. Əli *(radiyallahu anhu)* özü qalxdı və bir birinin ardınca öldürülən çoxlu insan cəsədlərinin yanına gələdi və dedi: **"Onları bir bir qaldırın!"**. Nəhayət onu cəsədlərin altında tapdılar. Bu zaman Əli *(radiyallahu anhu)* "Allahu əkbər" deyərək buyurdu: "Allah doğru demiş, Rəsulu *(sallallahu aleyhi və səlləm)* isə onu çatdırmışdır". Sonra Ubeydə əs-

---

[61] əz-Zəhəbi *Siyar A`ləmuun Nubala (5/298)* əsərində demişdir: "Sələmə İbn Kuheyl İbn Huseyn Əbu Yahya əl-Hədrami, sonra ət-Tanai əl-Kufi. Onun oğlu Yəhya İbn Sələmə demişdir: "Mənim atam hicrətin 47-ci ilində anadan olmuş və hicrətin 101-ci ilində Məhərrəm ayının 10-da dünyasını dəyişmişdir".

[62] İbn Mnzur Lisanul Ərəb kitabında *(5/118)* demişdir: "Bu körpü deməkdir". Əl-Əzim Abadi *Avnul Məbud* əsərində *(13/82)* demişdir: "Yəni, *(Xəvariclərlə)* döyüş baş verən körpünün yanına gəldikdə. Bu körpü əz-Zəbərcan körpüsü idi".

[63] əz-Zərkəli *əl-Əlam* əsərində *(4/288)* bildirmişdir: "O əl-Əzd deyilən yerdən idi. *(Xəvariclərin bir firqəsi sayılan)* İbadiyyələrin başçılarından idi. Elmli, bəlağətli və cəsur idi. Ibadətlərində heyrətamiz idi".

[64] Yaqut əl-Həmavi *Mucamul Buldan (2/283)* əsərində demişdir: "Bu yerin Kufədən kənarda bir şəhər olduğu söylənilir. Həmçinin, Kufədən iki mil kənarda yerləşən, Xəvariclərin Əli İbn Əbi Talibə qarşı çıxmaq üçün endikləri yer olduğu da deyilir. Onlar bu yerin adı ilə *(əl-Həruriyyə: Həririlər)* adlandırılmışlar".

[65] Nəvəvi *Şərh Səhih Müslimdə (7/172)* demişdir: "Yəni, onlar nizələrini bir az aralıdan qarşı tərəfin üzərinə atdılar".

[66] Əbu Ubeyd əl-Qasim İbn Sallam *əl-Ğarib* əsərində *(s.66)* demişdir: "Bu əli şikəst olan adama deyilir. Yəni, əli kəsilmişdir".

Salmani[67] onun qarşısına gəlib dedi: "Ey möminlərin əmiri! Özündən başqa ibadətə haqqı olmayan Allaha and verirəm, sən bu hədisi Allahın Rəsulundan *(sallallahu aleyhi və səlləm)* eşitmisən? O dedi: "Bəli, Özündən başqa ibadətə haqqı olmayan Allaha and olsun ki, mən bu hədisi Allahın Rəsulundan *(sallallahu aleyhi və səlləm)* eşitmişəm". Ubeydə Əlidən üç dəfə and içməyini xahiş etdi, o da and içdi[68]". Müslim rəvayət etmişdir.

Həmçinin Əbu Səidin *(radiyallahu anhu)* rəvayətində deyilir: Peyğəmbər *(sallallahu aleyhi və səlləm)* İslam ümməti arasından çıxacaq bir tayfanı xatırladaraq buyurdu ki, ***onlar insanların parçalandığı zamanda meydana çıxacaq və simaları daim başlarını qırxmaq[69] olacaqdır. Onlar, məxluqatın ən şəri və ya məxluqatın ən şər təbəqəsindən olacaqlar. Haqqa daha yaxın olan iki tayfadan biri onlara qarşı döyüşəcəkdir".***

Sonra Əbu Səid dedi: "Ey İraq camaatı! Siz də onları öldürdünüz"[70].

Əhməd deyir: Muhəmməd ibn Cəfər, Əvfdən, o da Əbu Nədradan o isə Əbu Səid əl-Xudridən rəvayət edərək Peyğəmbərin *(sallallahu aleyhi və səlləm)* belə buyurduğunu demişdir: ***"Mənim ümmətim iki firqəyə parçalanacaqdır. Maariqah onların ikisinin arasında***

---

[67] əz-Zəhəbi *Siyar Əlaamun Nubala (4/40)* əsərində demişdir: "Ubeydə İbn Amr əs-Salmani əl-Kufi əl-Muradi, fiqh alimlərindən, görkəmli şəxslərdəndir. O İslamı Məkkə fəth olunan ildə Yəməndə qəbul etmişdir. Heç vaxt Peyğəmbərin *(sallallahu aleyhi və səlləm)* yanında olmamışdır, lakin Əli, İbn Məsud və başqa səhabələrdən elm almışdır. *Fiqhdə* məharətli, *hədisdə* isə dəqiq idi. Hicrətin 72-ci ilində dünyasını dəyişmişdir".

[68] Müslim *(№1066)* rəvayət etmişdir.

[69] Nəvəvi *Şərh Səhih Müslim (7/167)* əsərində demişdir : "*Ət-Təhəəluqdan* nəzərdə tutulan məna başları qırxmaqdır. Ona görə də bəzi insanlar bunu dəlil gətirərək baş qırxmağın *məkruh* olduğunu söyləmişlər, lakin bunda onun üçün dəlil yoxdur. Bu yalnız onların əlamətlərindən biridir və əlamət də haram, və yaxud halal olan bir şey ola bilər."

[70] Müslim *(№1065)* rəvayət etmişdir.

***olacaqdır. Bu iki tayfanın içindən haqqa daha yaxın olanı onları öldürəcəkdir"***[71]**.**

Ibn Kəsir *(Allah ona rəhmət etsin!)* demişdir: "Bu hədis Peyğəmbərliyin sübutudur. Baş verən hadisə Peyğəmbərin *(sallallahu aleyhi və səlləm)* xəbər verdiyi kimi olmuşdur. Cahil və zalım Rafizi firqəsinin "*(Müaviyə ilə döyüşə qatıldıqlarına görə)* ***Şam camaatının kafir olması"*** iddiasından fərqli olaraq bu hədis hər iki tayfanın: o zaman *(Müaviyənin tərəfdarları sayılan)* Şam və *(Əlinin tərəfini tutan)* İraq camaatının *(aralarında baş verən müharibələrə rəğmən)* müsəlman olmasına bir sübutdur. Həmçinin bu hədis göstərir ki, *(o döyüşlərdə)* Əlinin tərəfdarları haqqa daha yaxın idilər.

Əhli Sünnə və Camaatın məzhəbinə görə Müaviyə ictihad edərək xəta etmiş Əli isə bu məsələdə doğru rəydə olmuşdur. İnşallah Müaviyə etdiyi ictihada görə bir savab qazanmışdır. Əli isə daha doğru düşündüyü üçün inşallah iki savab qazanmışdır. Eynilə, Buxaridə Amr İbn əl-As *(radiyallahu anhu)* rəvayət edən hədisdə Allahın Rəsulunun *(sallallahu aleyhi və səlləm)* belə buyurduğu deyilmişdir: ***"Hakim fətva vermək üçün bütün səyini ortaya qoyarsa və düzgün fətva verərsə ona iki savab vardır. Lakin fətva vermək üçün bütün səyini ortaya qoyarsa və xata edərsə, ona bir savab vardır"***[72]**.** İbn Kəsirin sözlərinin sonu[73].

Əli *(radiyallahu anhu)* xəvaric firqəsinə qarşı vuruşmuşdur. Şam vilayətində Səffeyn döyüşünü bitirəndən sonra Kufəyə qayıtdı. Kufəyə daxil olanda, ordudan bir dəstə ayrıldı. Deyilənə görə onların sayı on altı yaxud on iki min və ya daha az olmuşdur. Onlar Əlidən ayrılıb ona qarşı qiyam qaldırdılar. Əlinin etdiyi bəzi işlərə öz etirazlarını bildirdilər. Ona görə də Əli τ, Abdullah İbn Abbası τ müəyyən məsələlərə aydınlıq gətirmək üçün onların yanına

---

[71] Müslim *(№1065)* və Əhməd *(3/79)* rəvayət etmişdir və bu mətn Əhmədin rəvayətindəndir.

[72] Buxari *(№7352)* və Müslim *(№1716)* rəvayət etmişdir.

[73] Bax.*Əl-Bidəyə vən Nihəyə (10/563).*

göndərdi. İbn Abbas bir çox məsələlər haqda onlarla mübahisə etdi və onların ehtimal etdikləri şübhələri cavablandırdı. Öz şübhələrinin bir həqiqət olmadığını biləndə bəziləri peşman olub fikrindən döndü qalanları isə kor-koranə tutduqları yoldan əl çəkmədilər.

Deyilənə görə Əli *(radiyallahu anhu)* onların yanına gedib onlarla narazı qaldıqları məsələləri müzakirə etmiş və onlar da tutduqları yoldan geri dönərək Əli *(Allah ondan razı olsun!)* ilə birlikdə Kufəyə daxil olmuşdular. Daha sonra yenidən əvvəllki niyyətlərinə qayıdaraq bağladıqları əhdi və müqaviləni pozdular. Öz aralarında "yaxşı işləri tələb etmək və pis işlərdən çəkindirmək *(əl-Əmr bil məruf vən nəhy anil munkər)*", insanları bu işə cəlb etmək məsələsi haqqında razılığa gəldilər. Sonra onlar Nəhrəvan[74] adlanan yerə yola düşdülər və orada Əli *(radiyallahu anhu)* onlara qarşı döyüşdü[75].

Bu nadanlar digər insanlara münasibətdə itaət və ibadətdə daha çox çalışqan idilər. Onlar, düzgün və möhkəm əqidə sahiblərinin qılmadıqları dərəcədə namaz qılacaq və digər ibadətləri yerinə yetirəcəkləri haqda Peyğəmər *(sallallahu aleyhi və səlləm)* əvvəlcədən belə bir xəbər vermişdir: ***"Siz öz namazınızı onların namazı, orucunuzu onların orucu ilə müqayisədə az görəcəksiniz"***[76]. Onlar ibadətlərini daha da çoxaltsalar yenə də bunun onlara bir xeyri olan deyil! Sual olunur: Nə üçün? Çünki Allah, əməli iki şərt əsasında qəbul edir.

**Birinci:** Əməl, Uca Allahın rizası üçün ixlasla edilməlidir. Bu işdə riya və ya özünü göstərmək kimi amillər olmamalıdır.

**Ikinci:** Əməl, Allahın Elçisinin *(sallallahu aleyhi və səlləm)* Sünnəsinə müvafiq olmalıdır.

---

[74] Yaqut *Mucamul Buldaan* əsərində demişdir: "Adətən Nəhravan və yaxud ən-Nahravan adlanan yer üç: əl-Alə, əl-Avsat və əl-Əsfəl - adlı çayı əhatə edir. Qərb tərəfdən Bağdad ilə əl-Vasit arasında geniş kəndin yanında yerləşir. Şimal sərhədi Bağdada çatır onun daxilində çox şəhərlər vardır və onlardan: İskaf, Carcaraya, əs-Safiya, Dar Qanaa və s. Möminlərin Əmiri Əli *(radiyallhu anhu)* ilə Xəvariclər arasında məşhur hadisə həmin yerdə baş vermişdir".

[75] İbn Kəsir *əl-Bidayə və`n Nihayə* əsərində *(10/564)* rəvayət etmişdir.

[76] Müslim *(№1064)* rəvayət etmişdir

Allah təalə buyurur: ***“Hansınızın daha gözəl əməl sahibi olacağını sınayıb bilmək üçün göyləri və yeri altı gündə yaradan Odur”*** *(Hud 11:7).*

Fudeyl ibn İyad *(rahiməhullah)* ayədəki ***“daha gözəl əməl”*** sözləri haqda demişdir: “Bu, ixlaslı *(sırf Allah xatirinə edilən)* və *(şəriətə uyğun olan)* doğru olan əməldir. Əgər əməl doğru olub, ixlaslı olmasa, yaxud ixlaslı olub doğru olmasa məqbul sayılmaz. Ona görə əməl məqbul sayılmaq üçün ixlaslı *(sırf Allah xatirinə)* və doğru olmalıdır”[77].

Müsəlmanın Allah xatirinə etdiyi əməllərin məqbul olması üçün ixlaslı olması şərtdir. Əgər gördüyü işdə Allahla bərabər kimisə Ona şərik qoşarsa, əməli qəbul olunmayacaqdır. Kimsə elmsiz ibadət etdiyi halda riyakarlıqdan və şan-şöhrətdən uzaq olmaqla ixlasa əməl edərsə, amma işinin şəriətə, Sünnəyə uyğunluğunu nəzərə almazsa, bu əməli ixlaslı olsa belə məqbul sayılmaz. Ona görə də müsəlman öz əməlinin şəriətə uyğun, doğru və Allah xatirinə edilən ixlaslı olmasına cəhd etməlidir.

Yuxarıda qeyd edilən bu insanların əməli ixlaslıydı, amma şəriətə uyğun olmadığı üçün nə qədər ibadət etsələr də dində ifrata vardıqları, cahillikləri və müsəlmanları təkfir etdikləri üçün dindən çıxmış, uzaqlaşmışlar.

Onların cahilliyini təsdiq edən sübut, Əlinin *(radiyallahu anhu)* dövründə baş verən bu əhvalatdır. Əli *(radiyallahu anhu)* xatib kimi ayağa qalxıb, onları düşmənlə üzləşdikdə cihad etməyə və səbrli olmağa təşviq etdi. Əli *(radiyallahu anhu)* Şam camaatına hücum etməyə qərarlı olduğu zaman, bir də ona xəbər çatdı ki, xəvariclər yer üzündə fitnə-fəsad törədir, qan tökür, yol kəsir və insanların namusuna toxunurlar. Onların nahaq yerə öldürdükləri arasında Peyğəmbərin *(sallallahu aleyhi və səlləm)* səhabələrindən olan Abdullah İbn Xabbab

---

[77] Əbu Nuaym *Hilyatul Avliya (8/95)* əsərində və Şeyxulislam İbn Teymiyyə *Macmuul Fətavada (1/333)* rəvayət etmişdir.

(*radiyallahu anhu)* var idi. Onu, hamilə arvadı ilə birlikdə əsir götürmüşdülər.

Xəvariclər ona dedilər: “Sən kimsən? ” O dedi: “Mən, Allah Rəsulunun *(sallallahu aleyhi və salləm)* səhabəsi Abdullah ibn Xabbabam. Siz məni qorxudursunuz”. Onlar dedilər: “Sənə bizdən heç bir zərər toxunmaz. Atandan eşitdiklərini bizə danış!” O dedi: “ Mən atamın belə dediyini eşitdim: “Mən Allah Rəsulunun *(sallallahu aleyhi və salləm)* belə dediyini eşitdim: “Fitnə baş qaldıracaq. O zaman oturan durandan, duran gəzəndən, gəzən də qaçandan xeyirli olacaqdır”[78]. Onlar onun əlindən bağlayıb aparırdılar. Yolda gedərkən, Zimmilərdən[79]bir nəfərə məxsus donuza rast gəldilər. Onlardan biri qılıncı ilə donuzu vuraraq dərisini parçaladı. Başqa biri isə dedi: “Sən

---

[78] **Səhih:** İmam Əhməd *əl-Müsnəd (5/110)* əsərində demişdir: “İsmail bizə rəvayət etmişdir ki, Əyyub bizə Humeyd İbn Hilaldan, o da Xəvariclərlə olan daha sonra onlardan uzaqlaşan Abdul Qeys qəbiləsindən bir kişidən rəvayət etmişdir... *(sonra hədis sonuna qədər rəvayət edilir)*”. AbdurRəzzaq *Müsənnəf (№18578)*, ət-Tabarani *Mucamul Kəbir (№3631)*, Əcurri *əş-Şəriə (1/165)*, Daraqutni *Sünən (№157)* kitabında rəvayət etmişlər. Heysəmi *Məcməuz Zəvaid (7/302)* əsərində demişdir: “Mən Abdul Qeysdən olan kişinin adını bilmirəm, digər rəvayətçilər isə etibarlıdırlar”. Şeyx Albani *İrvaul Ğalil (8/103)* əsərində demişdir: “Adı çəkilməyən *(AbdulQeysli)* kişidən başqa bütün rəvayətçiləri etibarlıdır. Bununla belə, Cundub İbn Süfyanın hədisi bu rəvayətə dəstək verir”. Mən deyirəm: Bunu Əhməd *Müsnəd (1/169)*, Tirmizi *(№2194)* Səəd İbn Əbi Vaqqas hədisində rəvayət etmişdir. Həmçinin, Əhməd *Müsnəd (4/416)*, Əbu Davud *(№4259)*, İbn Hibban *Səhih (№5931)* kitabında rəvayət etmişlər. Sənani *Subulus Salam (4/60)* əsərində demişdir: “Hədis çox yolla rəvayət edilmişdir və onların hamısında adı məlum olmayan rəvayətçi vardır. Əhməd və Təbarani tərəfindən məlum olmayan rəvayətçinin yolundan başqa bir yolla rəvayət edilmişdir. Bununla belə, onların arasında Əli İbn Zeyd İbn Cədan var və onunla əlaqədar mənfi ifadələr vardır. Əhməd və Tirmizi bu hədisi Sad İbn Əbi Vaqqas hədisindən rəvayət etmişlər və Əhməd bunu İbn Ömər hədisindən rəvayət etmişdir. Əhməd, Əbu Davud və İbn Hibban Əbu Musa hədisindən rəvayət edirlər. Quşeyri hədisə səhih demiş və Şeyxeynin *(Buxari və Müslim)* şərtləri üzərində olduğunu bildirmişdir. Ona görə də hədis rəvayət olunan çox saylı yollar vasitəsilə gücləndirilir.

[79] Zimmi: Müsəlmanlar arasında yaşayıb vergi ödəməklə öz dinində qalan yəhudi və ya xaçpərəst.

nə üçün belə etdin! Axı bu zimmiyə məxsusdur?!”. O zimminin yanına gedib onunla mehriban danışaraq onu razı saldı! Həmçinin onlarla birlikdə olarkən xurma ağacından bir xurma düşdü və bir nəfər onu götürüb ağzına atdı. İçlərindən biri ona dedi: “Sən icazə olmadan və ya pulunu ödəmədən götürürsən?!”. O isə dərhal xurmanı ağzından atdı. **Bununla yanaşı, onlar** *(Səhabələrdən olan)* **Abdullah ibn Xabbabın yanına gəldilər və onun başını kəsdilər. Sonra onun həyat yoldaşının yanına gəldikdə, o dedi: “Mən hamilə qadınam, Qüdrətli və Əzəmətli Allahdan qorxmursunuz?!”. Beləcə onun da başını kəsib qarnını cıraraq dölünü çıxarıb bayıra atdılar”[80].**

**Baxın görün!!!** Onlar xırda bir işdə necə ehtiyatlanır, lakin müqəddəsliyi çox ciddi olan qanı tökməkdən ehtiyatlanmırlar. **Donuzu öldürməkdən ehtiyatlanaraq gedib sahibini razı saldılar; axı o zimmi kafirə məxsus idi!** Eyni zamanda ağacdan düşən xurmanı yeməkdən ehtiyatlandılar, amma **müsəlmanı öldürməkdən ehtiyatlanmadılar.**

Bu, günümüzdəki əksər azmış insanların simasıdır. Misal olaraq, onlar xaçpərəst ölkələrdən idxal olunan əti yeməkdən ehtiyatlanır, müsəlmanları təkfir etməkdən - filankəs və filankəs kafirdir! - deməkdən ehtiyatlanmırlar. Onlardan soruşanda ki, sizin bu barədə dəliliniz nədir? – sübut axtarmağa çalışırlar. Hansısa rəhbəri və ya başqa insanı təkfir etməkdən ötrü bəzi şəriət dəlillərini öz nəfsinə və istəklərinə uyğun yozmağa və təhrif etməyə çalışırlar. Çünki o, ilk olaraq rəhbəri təkfir etməsə işi düz alınmaz, rəhbərə qarşı üsyanın vacibliyində sözü keçməz.

İnsanlar bilirlər ki, üsyan yalnız küfr edən rəhbərlərə qarşı olur. Ona görə də ilk olaraq rəhbərə kafir deməkdən başlayır, sonra insanları, rəhbərin İslamdan xaric olub kafir olduğuna inandırmağa

---

[80] İbn Kəsir, *Bidayə vən Nihayə (10/583)*

çalışırlar. Insanlar bu fikirlə razılaşdıqdan sonra onların diqqətini rəhbərə qarşı üsyana yönəldirlər.

Bu, hal-hazırda əksər müsəlmanların düşdükləri fəlakətdir. Təkfir məsələsi ağır məsələdir, əsla asan deyildir. Ona görə, Allahın öz Kitabında aydın və birmənalı şəkildə təkfir etdiyindən, yaxud Peyğəmbərin *(sallallahu aleyhi və sələm)* Sünnəsində təkfir etdiyindən, ya da müsəlmanların yekdilliklə təkfir etdiyi kimsədən başqa heç kəs təkfir olunmamalıdır.

Əli *(radiyallahu anhu)* demişdir: "Allahın Elçisi *(ona və ailəsinə Allahın salavatı və salamı olsun!)* Zubeyri, Miqdad ibn əl-Əsvədi və məni iş dalınca göndərdi və dedi: "Xax[81] bağına qədər gedin, orada bir qadın olacaq və onun üstündə məktub var. Məktubu ondan alın". Biz bağa çatana qədər atlarımızı çaparaq sürdük və orada qadını gördük və dedik: "Məktubu bizə ver!" O dedi: "Məndə məktub yoxdur!" Biz dedik: "Məktubu çıxar, yoxsa paltarlarını soyunduracağıq!" Bundan sonra məktubu hörülmüş saçından çıxardı. Məktubu götürüb Allahın Elçisinin *(sallallahu aleyhi və səlləm)* yanına gəldik. Məktubda Hatib ibn Əbi Baltəah bəzi məkkəli müşriklərə Allahın Elçisinin *(sallallahu aleyhi və səlləm)* görəcəyi işlərindən xəbər vermişdi. Allahın Elçisi *(sallallahu aleyhi və səlləm)* dedi: **"Ey Hatib, bu nədir?"** O dedi: "Ey Allahın Elçisi, mənə qəzəblənmə. Mən Qureyşə gəlmə bir insan idim, onlardan deyildim. Səninlə olan Mühacirlərin mallarını və ailələrini qorumaq üçün Məkkədə qan qohumları vardır. Mən də onlarla qan qohumluğum olmadığı üçün istədim ki, onların arasından mənim ailəmə kömək edən tərəfdar tapım. Mən bunu kafir olduğumdan, dindən imtina və ya küfrə meyl etdiyimdən etməmişəm!" Allahın Elçisi *(sallallahu aleyhi və səlləm)* dedi: **"O sizə haqqı dedi"**. Bu zaman Ömər *(Allah ondan razı olsun!)* dedi: "Ey Allahın Elçisi, icazə ver bu münafiqin boynunu vurum!" O dedi: "O, Bədr döyüşündə iştirak etmişdir. Sən bil ki, Allah Bədr

[81] Yaqut *Mucam (2/383)* əsərində demişdir: "Mədinəyə yaxın ,Harameyn arasında yerdir."

camaatı haqqında demişdir: Nə istəyirsinizə edin, çünki sizi bağışlamışam"[82].

Heç şübhəsiz, Allahın düşmənləri ilə dostluq etmək Allahın bu sözlərinə əsasən küfr sayılır:

***"Ey iman gətirənlər! Nə mənim düşmənimi, nə də özünüzün düşmənini dost tutmayın!"*** *(Mumtəhinə:1).*

Göründüyü kimi, Hatibin əməli zahirən küfr idi. Peyğəmbər *(sallallahu aleyhi və səlləm)* ondan bu əməli etməyinin səbəbini soruşduqda bunu dinində tərəddüd etdiyi üçün deyil, Qureyş qəbiləsi arasında hami taparaq öz malını və ailəsini qorumaq üçün etdiyini demişdir.

Hatibin əməlinin zahirən küfr olmasına baxmayaraq, onun daxilində zahiri mənaya zidd olan bir sübüt olduğu üçün küfr hökmünü ona tətbiq etmək, nə də onu İslamdan çıxarmaq düzgün deyildir.

Bu qəbildən olan misallardan biri də İsrailli kişinin hekayəsidir. ***"Öz əməllərinə, ağına-bozuna fikir verməyən bir kişi var idi. O, ölüm ayağında uşaqlarına belə deyir: "Mən öləndə, mənim meyidimi yandırın, külümü ovalayıb, küləkli havaya səpələyin. Allaha and olsun! Əgər Allahın məni yığmağa gücü çatarsa, o mənə heç kəsə vermədiyi bir əzab verəcəkdir". Kişi öləndə, onu dediyi kimi etdilər. Allah yerə əmr edərək buyurdu: "Sənin üzərində ona aid nə varsa onu topla!" Beləcə yer, əmri yerinə yetirdi və kişi özünü dayanmış halda gördü. Bu halda Allah təalə ona buyurdu: "Səni, bu işi etməyə nə vadar etdi?". O, deyir: "Ey Rəbbim! Səndən qorxum". Və Allah onu bağışlayır"***[83]. Yəni o, Əzəmətli və Uca Rəbbindən qorxduğu üçün bunu etmişdi.

Şeyxülislam İbn Teymiyyə demişdir: **"Bu insan Allahın qüdrətinə və külünün səpələnməsindən sonra yenidən dirildilməsinin mümkünlüyünə şübhə etmişdi. Hətta onun etiqadına əsasən belə**

[82] Buxari *(№3983)* və Müslim *(№2494)* rəvayət etmişdir.
[83] Buxari *(№3481)* və Müslim *(№2756)* rəvayət etmişdir.

**halda onun dirildilməsi mümkün deyildi. Bu etiqad isə müsəlmanların yekdil fikrinə əsasən küfrdür. Lakin o cahil idi, bunu bilmirdi. Digər tərəfdən isə o, Allahın onu cəzalandırmasından qorxan mömin idi. Ona görə də onu bağışladı"**[84].

Bu məsələ əhəmiyyətsiz ya da asan bir iş deyildir ki, hansısa müsəlmanı əsaslı dəlillər olmadan kafir sayasan. Hətta kiminsə küfrü üçün kəskin sübutlar olsa da bunu mötəbər və müdrik elm adamları etməlidir.

Imam İbn Kəsir *(Allah ona rəhmət etsin!)* xəvariclər haqda demişdir: "Mən deyirəm: Bu insan tayfası Adəm övladlarının ən qəribəsidir. Öz məxluqatını istədiyi kimi fərqləndirən və hər şeyi əzəmətli qəza-qədərə yazan Allah necə də nöqsansızdır. Bəzi sələflərin: "bu ayədə qeyd olunanlar xəvariclərdir" – deməsi, necə də gözəldir. ***"(Ya Rəsulum!) De:"Sizə əməlləri baxımından (axirətdə) ən çox ziyana uğrayanlar barəsində xəbər verimmi? O kəslər ki, onların dünyadakı zəhməti boşa getmişdir. Halbuki onlar yaxşı işlər gördüklərini (və bunun müqabilində mükafata nail olacaqlarını) zənn edirlər. Onlar o kəslərdir ki, Rəbbinin ayələrini və Onunla qarşılaşacaqlarını (qiyamət günü dirilib haqq-hesab üçün Onun hüzurunda duracaqlarını inkar etdilər, bununla da onların bütün əməlləri puça çıxdı. Buna görə də Biz (qiyamət günü) onlar üçün bir daş-tərəzi qurmayacağıq!"*** *(Kəhf: 103:105)*

Deməli zəlalətdə olan bu cahil və nadanlar, sözündə və əməlində bədbəxt olanlar müsəlman toplumundan ayrılmaq üçün bir fikrə gəlmişlər. Onlar Mədəin adlı bir yerdə qərarlaşandan və özlərini möhkəmlədəndən sonra qardaşları və həmfikirlərini yanlarına çağırırlar ki, bir yerə toplaşsınlar. Zeyd ibn Hüseyn ət-Taii[85] onlara *(əl-*

---

[84] Bax. *Macmuul Fatava (3/231)*

[85] Hafiz İbn Həcər *əl-İsabə* əsərində *(1/547)* demişdir: "Zeyd İbn Huseyn ət-Tai, daha sonra əş-Şabi. Heysəm İbn Adiyy, o da Yunus İbn Əbi İshaq, o da Əbu Səfər əl-Həmədanidən qeyd etmişdir ki o Kufə sərhədləri yaxınlığında Ömər İbn Xəttabın

*Mədainə getmək istəyən xəvariclərə)* dedi: Siz Mədainə belə dəstə-dəstə daxil ola bilməzsiniz. Orada güclü ordu var və onlar sizə imkan verməzlər. Siz öz adamlarınıza Cux[86] çayı üzərindəki körpüyə gəlməyi söyləyin. Sizi tanımasınlar deyə Kufədən tək-tək çıxın, dəstə-dəstə çıxmayın. Onlar Bəsrə şəhərindən və digər yerlərdən olan öz həmfikirlərinə ümumi bir məktub yazaraq deyilən çay ətrafında toplaşmağı və əlbir olmağı bildirdilər. Bu xəbəri eşidəndən sonra maneələrə rast gəlməmək üçün şəhərlərdən bir-bir çıxırdılar. Onlar, atadan, anadan, qardaşdan, dayıdan, xaladan və bütün qohumlardan xəbərsiz evlərini tərk etdilər. Cahillikləri, az elmləri və kiçik ağılları ilə etdikləri əməlin göylərin və yerin Rəbbini razı saldığını düşünürdülər. Daha bilmirdilər ki, bu işləri Allahın rəhmətindən və səmalardan qovulmuş, atamız Adəmə sonra onun zürriyyətinə sağ olduqları vaxtda ədavət bəsləmiş iblisin, onlar üçün gözəlləşdirdiyi ən böyük günahlardan, cəhənnəmə sürükləyən əməllərdəndir. Bizi bu iblisin şərrindən Öz qüvvəsi və iradəsi ilə qoruyan Allahdır. Həqiqətən O, duaları qəbul edəndir"[87].

Peyğəmbər *(sallallahu aleyhi və səlləm)*, hakimə qarşı üsyan edənlərə və ona itaətsizlik göstərənlərə qarşı vuruşmağı əmr etmişdir. Bu səbəbdən, Əzəmətli və Qüdrətli Allah açıq aydın vəhyində buyurur: ***"Əgər möminlərdən iki dəstə bir-biri ilə vuruşsa, onları dərhal barışdırın. Əgər onlardan biri təcavüzkarlıq etsə, təcavüzkarlıq edənlə Allahın əmrinə (itaətinə) qayıdana qədər vuruşun..."*** *(Hucurat:9).*

Göründüyü kimi Uca Allah təcavüzkarlıq edən dəstə ilə vuruşmağı əmr etmişdir.

---

*(radiyallahu anhu)* valisi idi. Muhamməd İbn Qudama *Əxbarul Xəvaric* əsərində bu haqda rəvayət etmişdir. Və o zamanlar qoşun əmirləri yalnız Səhabələrdən olurdu.

[86] Yaqut *əl-Mucam (2/207)* əsərində demişdir: "Bu çay adıdır. Yanında Bağdadın ucqar ərazisində qərb tərəfinə doğru böyük şəhər yerləşir. Onlardan ər-Razananı göstərmək olar.bu yer Xaniqin və Xozastan arasındadır.

[87] Bax. İbn Kəsir *əl-Bidayə vən Nihayə (7/228)*

Eynilə, Peyğəmbər *(sallallahu aleyhi və səlləm)* Əlinin *(radiyallahu anhu)* xəvariclərə qarşı savaşında haqlı olduğunu, onunla yanaşı vuruşanların zalımlara qarşı vuruşduğunu bildirmişdir. Buna görə, əgər bir dəstə insan müsəlmanların rəhbərinə qarşı həddini aşsalar, müsəlman camaat və ixtiyar sahibləri bu təcavüzkarlara qarşı vuruşmalıdırlar"[88].

Bir hədisdə göstərilir ki, xəvariclərin meydana çıxmaları müəyyən bir dövrlə məhdudlaşmır. Daha doğrusu, onlar bir çox dövrlərdə meydana çıxırlar və hətta Dəccal zühur edəndə də çıxacaqlar. Peyğəmbər *(sallallahu aleyhi və səlləm)* buyurmuşdur: ***"Axır zamanda bir dəstə insan peyda olacaqdır. Elə bil bu adam*** **(Zul Xuveysira)**[89] ***da onlardan biridir. Onlar Quran oxuyacaq, lakin oxuduqları boğazlarından aşağı keçməyəcəkdir. Onlar İslamdan - oxun ovlanmış şikardan çıxdığı kimi çıxacaqlar. Əsas əlamətlərinən biri daim başlarını qırxmaq***[90] ***olacaqdır. Onlar həmişə mövcud olacaqlar. Sonuncuları Dəccal ilə çıxacaqdır. Onlar məxluqatın ən şərlisi və ya məxluqatın ən şər təbəqəsindəndirlər."***[91] Hədisi Nəsai rəvayət etmişdir.

---

[88] İbnul Əsir *ən-Nihayə* əsərində **buğat** *(həddini aşanlar)* mənası ilə əlaqədar demişdir: "Ammarın hədisində bağı: yəni, zülmkar - dəstə onu öldürəcəkdir. Bağı, rəhbərə itaət etməkdən boyun qaçıran zalım dəstə deməkdir. *Bağı* sözünün əsli həddi aşmaqdır.

[89] Bu sözlər, Peyğəmbər *(ona və ailəsinə Allahın salavatı və salamı olsun!)* qəniməti böldüyü zaman bir kişiyə qənimət payı ayırmadıqda: Sən ədalətli bölgü etmədin!- deyən kişiyə işarədir.

[90] Nəvəvi *Şərh Səhih Müslim (7/167)* əsərində demişdir : "*Ət-Təhəluqdan* nəzərdə tutulan məna başları qırxmaqdır. Ona görə də bəzi insanlar bunu dəlil gətirərək baş qırxmağın məkruh olduğunu söyləmişlər. Lakin bu hədis deyilən məsələyə əsas vermir. Bu yalnız onların əlamətlərindən biridir. Əlamət də haram və ya halalla ola bilər".

[91] İmam Əhməd *Müsnəd (4/421)*, Nəsai *(7/119-121)*, İbn Əbi Şeybə *Müsənnəf (№37904)*, Bəzzar *Müsnəd (9/294)* və Heysəmi *Məcməuz Zəvaid (6/299)* rəvayət etmişlər. Hakim də *Müstədrək (№2647)*rəvayət etmiş və hədisin Müslimin şərtinə əsasən səhih olduğunu demişdir. Şeyx Albani *(Allah ona rəhmət etsin!)* isə hədisin zəif olduğunu demişdir.

Bu hədisdə Rəsulullah *(sallallahu aleyhi və səlləm)* demişdir: ***“Onlar daim mövcud olacaqlar. Sonuncuları Dəccal ilə çıxacaqdır”***. Hədisdə deyildiyi kimi bu insanlar hər zaman, qiyamətə yaxın, Dəccal çıxana qədər mövcud olacaqlar. Hətta onlardan bir dəstə Dəccalla birgə çıxacaqdır.

Alimlər bu hədisi Əliyə *(Allah ondan razı olsun!)* qarşı qiyam qaldırmış xəvariclərdən danışarkən qeyd edirlər. Həmçinin fikir versək görərik ki, bu hədis bir neçə il əvvəl Məscidül Həramı halal görərək, onun qapılarını bağlayan, neçə-neçə müsəlmanı qətlə yetirən, orada insanları on beş günə yaxın bir vaxtda namaz qılmaqdan məhrum edən dəstəyə də aiddir[92].

Əli *(radiyallahu anhu)* demişdir: “Peyğəmbərin *(sallallahu aleyhi və səlləm)* belə dediyini eşitdim. ***“Axır zamanda yaşca cavan, ağıldan zəif insanlar peyda olacaqdır. Onlar məxluqatın ən yaxşısının sözü ilə danışacaq, İslamdan oxun ovlanmış şikardan çıxdığı kimi çıxacaqlar. İmanları boğazlarından aşağı keçməyəcəkdir. Onlara qarşı mübarizə aparın. Bu işə görə Qiyamət günü mükafat vardır”***[93]. *Buxari, Müslim və Əbu Davud rəvayət etmişdir.*

Bu söz və sifətlər ilk zamanlar Əliyə *(radiyallahu anhu)* qarşı qiyam qaldırmış xəvariclərə uyğun deyildi. Çünki hədisdə ***“axır zamanda”*** sözü qeyd edilir. Xəvariclərlə əlaqədar əksər hədislərdə ***“axır zamanda”*** ifadəsi yox, ***“bir camaat peyda olacaqdır”*** ifadəsi qeyd edilir. Məlumdur ki, Əliyə qarşı qiyam edən xəvariclər əvvəl zamanda yaşayırdılar.

Sonra demişdir, ***“yaşca cavan olacaqlar”***. Ibn əl-Əsir demişdir: ***“yaşca cavan olacaqlar”*** sözü dolayısıyla cavan və erkən yaşda

---

[92] Hicrətin 1400-cü, miladın 1980-ci ilində Məkkənin əl-Həram məscidində baş verən bu hadisə Cüheyman hadisəsi adlandırılır. Bu zalım dəstəyə Cuheyman adlı bir nəfər başçılıq edirdi. Bu hadisədə çox insanlar öldürülmüş və fitnəsi bir neçə gün davam etmişdir. Allah bizi belə şərdən qorusun.

[93] Buxari *(№361)*, Müslim *(№1066)* və Əbu Davud *(№4767)*

olanlar mənasını ifadə edir"[94]. Onlar yetkinlik yaşına çatmamışlar ki, haqqdan xəbərləri də olsun. Bu həmçinin Məscidul Haramı mühasirəyə alanlara da tətbiq olunur. Halbuki, Əliyə *(radiyallahu anhu)* qarşı üsyan edən xəvariclər yaşlı insanlar idilər. Aralarında tayfa başçıları da var idi.

Sonra hədisdə ***"ağıldan zəif"*** deyilir: İbn əl-Əsir deyir ki, bu da anlayış, ağıl, düşüncə və tədbir baxımından zəif olan insan deməkdir"[95]. Bu təsvirlər dediyimiz insanlara aid edilir. Amma Əliyə *(Allah ondan razı olsun!)* qarşı qiyam qaldırmış xəvariclər isə ağıllı insanlar idilər səfeh deyildilər.

Sonra hədisdə ***"Onlar məxluqatın ən yaxşısının sözü ilə danışacaqlar"*** - sözü deyilir. Bu isə o deməkdir ki, onlar Peyğəmbər-in *(sallallahu aleyhi və sәlləm)* sözü ilə danışacaqlar. Bu açıqlama bəzi hədis şərhçilərinə görə düzgün sayılır[96]. Əlinin vaxtındakı xəvariclər isə belə deyərdilər: **"Rəbbimizin Kitabı bizə kifayətdir".**

Amma *(bir neçə il öncə Məkkədə)* qiyam edən[97] şəxslər hədislərə *(Peyğəmbərin kəlamlarına)* əməl etdiklərini iddia edirdilər. Təbii ki, onlar iddia etdikləri kimi haqlı deyil, əksinə zəlalət içində idilər. Məxluqatın ən yaxşısının sözü ilə danışar, Peyğəmbər kəlamlarına əməl etdiklərini, hədis əhli olduqlarını iddia edərdilər. Lakin onlarda bu iddialarından heç bir əsər-əlamət olmazdı. Əslində onlar Peyğəmbərin *(sallallahu aleyhi və sәlləm)* hədisini başa düşməmiş, azyaşlı idilər. Bu məsələ aydındır və bu hadisədən xəbəri olan hər kəs onların yaşca cavan, zəif anlayışlı, elm məclislərində iştirak etməyən cahil və cəmiyyətdə qeyri mötəbər olduqlarını bilirlər. Mənim düşündüyüm qədər bu hədis tam uyğunluqla bu insanlara aiddir. Hər halda onlar itaətkarlıqdan çıxmış, hakimə qarşı qiyam qaldırmış və şər əməl işləmişlər.

---

[94] Bax. *ən-Nihayə (1/351)*
[95] Bax. *ən-Nihayə (1/434)* və İbnul Əsir *(2/376)*
[96] Bax. əl-Əzim Abadi *Avnul Məbud (13/80)*
[97] Müəllif burada Məkkə hadisələrində olan **Cuheyman** adlı adamı demək istəyir.

Hədislərin birində deyilir: ***“Bir nəfərə İbrahim** (əleyhis salam) **məqamı ilə Kəbənin divarı arasında beyət ediləcəkdir** (sədaqət andı içiləcəkdir)**. Bu evi öz əhlindən** (yəni, müsəlmanlardan) **başqası** (orada qan axıtmaq üçün) **halal saymayacaqdır. Onlar evi halal saydıqda ərəblərin həlakından soruşmağa dəyməz!”***[98]. Bəzi alimlər bu hədisi Mehdinin gəlişinə aid edirlər. Lakin mənim fikrimə görə bu hədis həmin fitnədə beyət olunanlara aiddir. Çünki Kəbə evinin halal edilməsi *(orada qan axıdılması)* Mehdiyə beyət etməklə olmayacaqdır. Lakin o adama *(Cuheymana)* fitnə zamanı beyət edildikdə, Kəbə halal sayılmışdı *(orada qan axıdılmışdı)*. Daha yaxşısını Allah bilir!

Ötən yazılardan aydın olur ki, əsirlər boyu rəhbərlərə qarşı qiyam edənlər *"xəvaric"* adına, törətdikləri fəsadın böyük günahına və bu əməllərinin cəzasına layiqdirlər.

Günümüzdə terror törədərək qatı cinayətkarlıqla məşğul olan insanlar da öz cəzalarına çatmışlar[99]. Bu və digər ölkələrdə günahsız insanları öldürmək şəriətin qəbul etmədiyi səhv ictihaddır. Yuxarıda Peyğəmbərin *(sallallahu aleyhi və səlləm)* xəta edən müctəhid üçün bir, xata etməyən üçün isə iki savab olacağı sözü keçmişdi. Lakin bu hansı məsələlərə aiddir? Bu, ikinci dərəcəli məsələlərə *(fiqhi məsələlərə)* aiddir! Əqidə *(etiqad)* və mənhəc *(metod)* məsələlərində ictihad edənə heç bir savab yoxdur. Daha doğrusu, yalnız şəriət dəlilləri ilə kifayətlənmək vacibdir.

İbn Kəsir *(Allah ona rəhmət etsin!)* demişdir: “Nəhravan günü çatanda, insanlar deyirdilər: “Onların kökünü kəsən möminlərin Əmiri! Allaha həmd olsun!...” Əli *(radiyallahu anhu)* dedi: “Allaha and olsun elə

---

[98] İmam Əhməd *Müsnəd (2/351)*, İbn Hibban *Səhih (№6872)*, Hakim *Mustədrək (№8359)*, Tayalisi *Müsnəd (№2373)*, İbn Əbi Şeybə *Musənnəf (7/462)* və İbnul Cad *Musnəd (№2810)* kitablarında rəvayət etmişlər. Şeyx Albani *Səhih (№579)* demişdir: “Bu isnad səhihdir. Rəvayətçiləri Şeyxeynin *(Buxari Müslim)* etibarlı rəvayətçiləridir. Səid İbn Səman Buxari Müslimin rəvayətçilərindən deyil lakin o da etibarlı sayılır”.

[99] ər-Riyad şəhərinin Üləyya küçəsinsə baş verən terrorun iştirakçılarına edam hökmü tətbiq edilmişdi.

deyil! *(yəni, hələ də onların kökü kəsilməyib)* Onlar hələ də kişilərin belində, qadınların bətnində qalırlar *(yəni, hələ törəyəcəklər)*. Onlar şər insanlardan törəndikdə bir-iki nəfər adam tapan kimi qiyam etmək üçün qüvvələrini birləşdirərlər".

İbn Kəsir *(Allah ona rəhmət etsin!)* deyir: "Abdullah İbn Vəhb ər-Rasibi çox ibadət etdiyi üçün səcdə yerləri həddindən artıq bərkimişdi. Hətta ona hüccət sahibi deyərdilər".

Heysəm ibn Adiyy, bəzi xəvariclərin belə dediyini rəvayət edir: "Abdullah İbn Vəhb ər-Rasibi Əliyə bəslədiyi nifrətə görə onu **"inkarçı, inadkar"** adlandırardı.

Heysəm ibn Adiyy, İsmayılın Xaliddən, o da Əlqəmə ibn Amirdən belə dediyini rəvayət etmişdir: "Əlidən *(radiyallahu anhu)* Nəhravan camaatının müşrik olması haqqında soruşdular? O dedi: "Onlar Şirkdən qaçdılar". Dedilər: "Onlar münafiqdirlər?". O dedi: "Münafiqlər Allahı az zikr edirlər" Dedilər: "Ey möminlərin əmiri o zaman onlar kimlərdir?" O dedi: "Onlar bizə qarşı həddini aşan qardaşlarımızdır. Biz onlarla bizə qarşı həddini aşdıqları üçün vuruşuruq". İbn Kəsirin İbn Cərirdən nəql etdiyi rəvayət budur[100].

---

[100]Bax. əl-Bidayə vən Nihayə *(10/590)*.

# İNDİKİ ZAMANDA XƏVARİC FİKRİNİN ORTAYA ÇIXMA SƏBƏBLƏRİ

Bu ölkə[101] belə mənhəclərin, yəni təkfir mənhəclərinin əsla məkanı deyildir. Bu batil və iyrənc mənhəc bu ölkədən kənarda başlamışdır. Sual olunur, bəs bu ölkəyə necə daxil olmuşdur?!

Allaha həmd olsun ki, bu ölkə əvvəlki mötəbər sələf alimlərinin getdiyi yolunu davam etdirir. Ölkəmizdə insanların bu sələfi metodunu mənimsəməsi son əsrlərdə Islam dəvətinə başlamış Şeyx Muhəmməd ibn Əbdülvəhhabın *(Allah ona rəhmət etsin!)* başladığı sələfi dəvətinin nəticəsidir. O öz sələfi çağırışında Şeyxülislam ibn Teymiyyə, İbn əl-Qəyyim və başqa sələf alimlərindən bəhrələnmişdir. Düzgün dəvətin yayılmasına, İmam Muhəmməd İbn Səud *(Allah ona rəhmət etsin!)*, onun övladları və nəvələrinin köməyi ilə nail olunmuşdur. Indi biz bu nemətin bərəkətini yaşayırıq. İnsanlar vahid bir mənhəcə əsaslanaraq alimlərinə müxalif olmur, alimləri də bu yolda aralarında əsla ixtilaf etmirdilər.

Kim bu alimlərin mənhəci haqqında elmini artırmaq istəyirsə, **"əd-Durarus Səniyyə"** adlı kitabda cəm olunmuş elmi əsərləri oxusun.

Təkfirin əsası xaricdən gəlmiş insanlar tərəfindən, təəsübkeş cavanlar arasında təbliğ edilməklə yayılmışdır. Bu insanlar sələfi dəvətindən bəhrələnməyən insanlardır. Onlar cavanlar arasında parçalanma toxumlarını səpir və onları zəlalət dəstələrinə dəvət edirlər.

Məsələn, bəzi cavanlar bu ölkədən[102] Əfqanıstana gedərək orada özlərinə təkfir fikirlərini öyrədən insanları tapdılar. Əslində onlar *(başqa ölkəyə cihad adı ilə getmək əvəzinə)* öz ölkələrində qalmalı və

[101] Müəllif burada Səudiyyə Ərəbistanını nəzərdə tutur.
[102] Yəni, Səudiyyə Ərəbistanından.

insanları gözəl üslubla İslama dəvət etməli, cəmiyyətə fayda verən işlərlə məşğul olmalıydılar. Özlərinə əziyyət verəcək insanlarla üzləşməməliydilər. *(Lakin çox təəssüf)* Xəvariclərin metodu isə müxaliflərlə üz-üzə gəlmək, fitnəkarlıq etmək, çaxnaşma salmaq, rəhbərlərə açıq-aşkar narazılıq bildirmək, onların eyiblərini yaymaq və s. əməllərdir.

Onların öz rəhbərlərinə qarşı üsyan etməsi onların həbs edilməsi, əziyyət verilməsi və qovulması ilə nəticələndi. Bəziləri bu vəziyyətdə ölkəsindən qaçmış sonra alimləri, rəhbərləri və ümumiyyətlə müsəlmanları kafir saymaqla öz etirazlarını bildirmişlər. Onlar doğru əqidə və mənhəc məsələləri haqqında ən cahil insanlardır. Bəziləri bir neçə hədis və ya müəyyən elmi məsələləri əzbərləyərək özünü müfti və ya Şeyxülislam hesab edib, özünü haqlı sayaraq bütün ümməti kafir sayır. Beləliklə, elmlə silahlanmayan bəzi gənclər də onların təsiri altına düşürlər.

Partlayışlarda iştirak edənlərin istifadə etdiyi metod bu idi. Onlar öz əməllərinin doğru olduğunu zənn edərək səhv ictihad etmiş və bu ictihadlarına görə də üzürsüz sayılırlar. Çünki onlar alimlərdən elm almamışdılar. Ona görə hamı elm adamları ilə sıx əlaqədə olmalı və onlardan uzaqlaşmamalıdır. İbn Abbas *(Allah ondan razı olsun!)* Peyğəmbərin *(ona və ailəsinə Allahın salavatı və salamı olsun!)* belə buyurduğunu rəvayət edir: ***"Bərəkət sizin böyüklərinizlə olmağınızladır"***[103]. Bu hədisi İbn Hibban, əl-Xatib, əl-Qadi və Əbu Nuaym səhih isnadla rəvayət etmişlər. Onlar həmin gənclərin təkfir və ya digər məsələlərdə alimlərdən soruşacaqlarını bildikləri üçün bütün alimləri təkfir etmişlər. Hətta Şeyx Əbdül Əziz İbn Bəzz *(Allah*

---

[103] **Səhih:** İbn Hibban *Səhih (№559)*, əl-Xatib əl-Bağdadi *Tarixi Bağdad (№5862)*, əş-Şihab əl-Qudai *Müsnəd (1/57)* və Əbu Nuaym *Hilya (8/172)* kitabında rəvayət etmişdir. Həmçinin Təbarani *əl-Avsat (№8991)*, Hakim *Mustədrək (1/62)* və Beyhəqi Şuabul İman *(7/463)* kitabında rəvayət etmişlər. Hakim demişdir: "Hədis Buxarinin şərtinə əsasən səhihdir lakin Buxari onu rəvayət etməmişdir". əz-Zəhəbi də bu fikirlə razılaşmışdır.

*ona rəhmət etsin!)* kimi alimin minhəcinin doğruluğunu, onun Məhəmməd ibn İbrahimin tələbəsi olub və ondan öncə yaşamış: İbn Teymiyyə, İbn əl-Qeyyim, dörd məzhəb alimləri, tabiinlər, səhabələrə qədər olan alimlərin elmindən bəhrələndiyini bildikləri halda, onun kafir olmasını və buna görə ondan fətva qəbul edilmədiyini həmin gənclərə diktə etmişlər.

Bu gün dünənə necə də bənzəyir. Əlinin *(radiyallahu anhu)* dövründəki xəvariclər etdiklərinin doğruluğuna və bununla Allaha yaxınlaşdıqlarını düşünür, hətta buna inanırdılar. Ona görə Nəhravanda *(Əlinin qoşunu ilə döyüşə girəndə)* onlar belə deyərdilər: "Hökm yalnız Allahındır! Cənnətə gedin...gedin". Əbu Əyyub deyir: "Mən *(döyüş zamanı)* xəvariclərdən bir kişinin belinə nizə ilə zərbə endirərək, nizəni onun belinə sancdım və dedim: "Ey Allahın düşməni, Cəhənnəmə yaxşı yol!" O isə dedi: "Hansımızın ona daha erkən vasil olacağını sonra biləcəksən!".

Bu insanlar *(əvvəlki xəvariclər)* zəlalətdə olmalarına baxmayaraq, onlar can verəndə də öz əməllərində əzmkar, səbrli və güclü imanla haqlı olduqlarını etiqad edirdilər.

Elm iddiasında olan müxtəlif insanların ətrafına toplaşmaq və altmış, yetmiş, səksən il elm öyrənən və öyrədən, müdrik alimləri tərk etmək fitnə-fəsadın və zəlalətin yayılmasının əsas səbəblərindəndir. Bu alimlər öz müəllimlərindən dərs almış, onların kitablarını oxumuş və doğru mənhəci başa düşənlərdir. Kim bu alimlərdən elm öyrənər və onların sözünü dinləyərsə Allahın izni ilə bu bəladan qurtulacaqdır.

Kim bu alimlərdən uzaqlaşıb özü ictihad edər, bildiyi cüzi hədislərə arxalanar, yaxud hansısa cahilin, elmdən bixəbərin sözünü dinləyərsə, bu insan zəlalətə düşər. Munəvi adlı alim "Feydul Qədir" əsərində Peyğəmbərin *(ona və ailəsinə Allahın salavatı və salamı olsun!)* ***"Bərəkət, böyüklərinizlə olmaqdadır..."*** hədisinə şərh verərək deyir: ***"Bərəkət***

***böyüklərinizlə olmaqdadır***: yəni, doğru yolu tapmaq və örnək götürmək üçün təcrübəli və səriştəli böyüklərinizlə oturub durun"[104].

Buna baxmayaraq biz: Peyğəmbərdən *(ona və ailəsinə Allahın salavatı və salamı olsun!)* başqa məsum yoxdur - deyir və etiqad edirik. Ondan başqa bütün insanların sözü qəbul və rədd edilə bilər. Bizə görə Peyğəmbərin *(ona və ailəsinə Allahın salavatı və salamı olsun!)* hədisi, kiminsə rəyindən, istəyindən, yaxşılığı iddia olunan işlərdən daha üstündür.

Uca Allah buyurur: ***"Onlara (bəzi müsəlmanların sadəlövhlüyü üzündən döyüş meydanından münafiqlərə) əmin-amanlıq və ya qorxu xəbəri gəldikdə dərhal onu yayarlar. Halbuki əgər (müsəlmanlar) bunu (münafiqlərə deyil), Peyğəmbərə və ya özlərindən (möminlərdən) olan ixtiyar (əmr) sahiblərinə demiş olsaydılar, əlbəttə, həmin xəbəri onun mahiyyətinə varan (belə bir xəbərin yayılmasının məqsədəuyğun olub-olmadığını təyin etməyə qadir olan) kimsələr bilərdilər. Əgər Allahın lütfü (mərhəməti) olmasaydı, şübhəsiz ki, az bir qisminiz müstəsna olmaqla, şeytana uyardınız"*** *(ən-Nisa :83).*

Şeyx Abdurrahman əs-Sədi *(Allah ona rəhmət etsin!)* ayənin açıqlamasında deyir: **"Bu, bəyənilməyən bir iş gördükləri üçün Allah tərəfindən Öz qullarına verdiyi tərbiyədir. Ümmətə, əminamanlığa, sevinməyə, kədərlənməyə aid olan hansısa mühüm bir xəbər gəldikdə onu dəqiqləşdirməli, dərhal yaymamalıdırlar. Onlar bu xəbər haqda Peyğəmbərdən** ***(ona və ailəsinə Allahın salavatı və salamı olsun!)*** **və ya aralarında olan elmli, müdrik, münsif, ağıllı, rəşadətli, təcrübəli, yaxşını pisdən fərqləndirən, əmr vermək səlahiyyəti olan böyüklərə həvalə etməlidirlər"**[105].

Elmi zəif və təcrübəsi az olan insan, yaxşını pisdən ayıran təcrübəli insan ilə eyni ola bilməz. Böyük fəsadı dəf etmək üçün kiçik fəsada əməl edilir. Çox insan bu qaydanı bilmədiyi üçün aşağdakı hədisi özünə örnək götürür: "*(Rəhbərdən)*, qəti dəlil olan sırf küfr

---

[104] Bax. Mənavi *Faydul Qadir (3/220)*
[105] Bax. Abdur Rahmən əs-Sadi *Təysir Kərimir Rahmən fi Təfsir Kəlamil Mannan (2/113).*

gördükdə üsyan edə bilərsiniz"[106]. Bu hədisi oxuyandan sonra elə düşünür ki, öz düşüncəsiylə təkfir etdiyi rəhbərə qarşı üsyan edə bilər. Hələ bu işində özünü mücahid də hesab edir.

Bu, cihad anlayışı haqda səhv düşüncədir. Bəziləri elə düşünürlər ki, əlinə silah alıb istənilən kafirə qarşı döyüşməyi bacarar və etdiyi əməli də Allah yolunda cihad sayılar. Lakin bu açıq-aşkar zəlalət düşüncəsidir. Əhli Sünnə və camaat alimləri əqidə kitablarında qeyd edirlər ki, cihadı istənilən günahkar və ya yaxşı rəhbər ilə etmək lazımdır[107] və cihad yalnız rəhbərlərin əmri altında olmalıdır. Əgər rəhbər cihada çağırsa və cihad etsə sən də bu çağırışla cihada qoşul. Əgər rəhbər cihadı dayandırsa, kiminsə cihada davam etməsi səhvdir və etdiyi əməl də batil sayılır. Əgər rəhbərlər cihad etməyə imkanları oldukları halda, bilərəkdən onu dayandırsalar, buna görə günah qazanarlar. Lakin yenə də bu halda bir adam belə onlardan icazəsiz cihada başlaya bilməz.

Yaxşı, əgər rəhbər küfr etmişdirsə bəs ona qarşı üsyan necə olmalıdır? Bu haqda Əbul Məali əl-Cuveyni[108] demişdir: "Bu, sıravi insanların işi deyil, səlahiyyət sahiblərinin işidir"[109].

Əgər hakim kafir olarsa səlahiyyətli şəxslər onu dəyişdirib başqası ilə əvəz edirlər. Lakin bir şərtlə ki, buna görə fitnə olmasın və qan tökülməsin. İmam Əhməd *(Allah ona rəhmət etsin!)* də Abbasi xəlifələri: "Quran məxluqdur!" – dedikdə onlara belə münasibət bəsləmişdir. Onlar insanları: "Quran məxluqdur!" – deməyə məcbur edir, İmam Əhmədə və digər alimlərə bunu dedizdirmək üçün işgəncə verirdilər. Təbii ki, bu sözü demək küfrdür və İmam Əhməd:

---

[106] Buxari *(№7056)* və Müslim *(№1709)* rəvayət etmişlər.

[107] Bax. Lələkai *Şərhi usul etiqad əhlis sünnə vəl camaat (4, 1299)*, İbn Əbil İzz əl-Hənəfi *Şərh əl-Əqidəh ət-Təhaviyyə (2, 555)*, İbn Teymiyyə *Məcmu əl-Fətava (28, 503)*.

[108] Abdul Məlik İbn Abdullah İbn Yusuf əl-Cuveyni, əl-Nəysəburi əş-Şafii. Çox sayda kitabların müəllifidir. Hicrətin 419-cu ilinin əvvəlində anadan olmuş və 478-ci ildə vəfat etmişdir.

[109] Bax. *Ğiyasul Umam (səh.96)*

"Quran məxluqdur!" - deyəni təkfir edirdi. Lakin bəziləri İmam Əhmədin yanına gəlib: "Biz bunlara qarşı üsyan etmək istəyirik, fitnə artıq çox böyüyüb!" – dedikdə, o buyurmuşdu: "Mən bunu sizə halal görmürəm. Fitnə zamanı qılınc işləsə qan axıdılar, yollar kəsilər, insanların namusları tapdalanar. Siz, pis rəhbərdən qurtulub, yaxşısı gələnə qədər səbr edin!"[110].

Bu, müsəlmanların rəhbərləri və sələf alimləri tərəfindən başa düşülən əsas prinsip olmuşdur. Belə ki, əgər hakim kafir olarsa yalnız ixtiyar sahibləri fitnə-fəsada yol vermədən, qan axıdılmadan, onu vəzifəsindən kənarlaşdıra bilərlər. Aşağdakı səbəblərə görə sıravi insanlar bunu edə bilməzlər.

**Birinci:** Ola bilər onlar təkfir etmək məsələsində səhv etsinlər.

**İkinci:** Əgər onlardan bəziləri üsyana qatılsa, digərləri isə qatılmasa o zaman arada ixtilaf düşəcək və fitnə olacaqdır.

**Üçüncü:** Onlar, səlahiyyət sahiblərindən fərqli olaraq, rəhbərin dəyişdirilməsi və ya ona qarşı üsyanın nəticəsinə əhəmiyyət vermirlər.

Kimsə deyə bilər ki, "Filan rəhbər dünyəvi qanunlarla *(Qavaninul vadiyya)* hökm verir, deməli o kafirdir!".

Biz isə ona deyirik ki, artıq tanınmış böyük və müdrik alimlər bu məsələ haqda danışmışlar. Bu məsələ Allahın hökmündən başqa bir hökmlə hakimlik etmək məsələsidir". İbn Abbas *(radiyallahu anhu)* demişdir: **"Bu, İslamdan çıxaran böyük küfrdən aşağı mərtəbədə olan kiçik küfr, kiçik asilik və kiçik zülmdür"**[111].

Əgər kimsə Allahın qanunlarını tərk edib dünyəvi qanunlarla hökm verirsə bizim onu kafir elan etməyimiz və İslam dinindən çıxarmağımız doğru deyildir. Əgər biz onun vəziyyətini dəqiq

---

[110] Bax. İbnul Xallal Sünnə *(1/134)*.

[111] **Səhih:** Muhəmməd İbn Nasr əl-Mərvəzi *Təzim Qadris Salət (2/522)*, Hakim *Müstədrək (№3219)* və Beyhəqi *Sunanul Kubra (8/20)* kitabında rəvayət etmişlər. Hakim demişdir: "Bu hədisin səhih isnadı var və Şeyxeyn bunu rəvayət etməmişdir." Zəhəbi də bu fikirlə razılaşmışdır.

yoxlasaq ki, bu insan digər hökmləri Allahın hökmündən daha gözəl görür, yaxud Allahın hökmünü əsla doğru saymırsa, məhz belə halda o, şübhəsiz kafir olur.

Lakin o, nəfsi istəkləri, dünyəvi mənfəət, vəzifəsini itirəcəyindən qorxaraq, hökmünə riayət olunmayacağını düşünərək, bununla belə Allahın hökmünün daha yaxşı olduğunu etiqad edirsə, belə insana kafir hökmü vermək, İslamdan çıxarmaq olmaz. Bu insan, rüşvət xətrinə Allahın hökmündən başqa bir hökmlə hakimlik edənə bənzəyir. İslam ümmətinin yekdil rəyinə əsasən belə insan kafir sayılmır, o sadəcə olaraq böyük günah sahibidir"[112].

Bu düzgün rəy, alimlərin bir fikridir[113]. Ümumiyyətlə kiməsə kafir deməkdə ən xırda şübhə varsa bu şübhə təkfirdən uzaqlaşmaq üçün yetərlidir.

---

[112] Şeyxul İslam İbn Teymiyyə *(Allah ona rəhmət etsin!)* Məcmuul Fətava *(22/61)* əsərində demişdir: "Günah etdikləri səbəbi ilə hakimlərə qarşı üsyan etmək düzgün deyil. Zina və bənzəri günahlara görə kiməsə ölüm hökmü tətbiq edilməsinə baxmayaraq, eyni günahı hakim edərsə *(zina və.s)* ona qarşı üsyan etmək olmaz. Çünki bu üsyan səbəbi ilə baş verən fitnə, hakim tərəfindən edilən böyük günahın fitnəsindən qat-qat çoxdur.

[113] Fayda üçün, Daimi Elmi Araşdırmalar və Fətvalar Komitəsinin mövzu ilə əlaqədar bəzi fətvalarını qeyd etmək istəyirik:

**Sual *(№2)* fətva *(№5226)*:** Təkfir nə zaman caizdir və nə zaman caiz deyildir? Allahın aşağıdakı sözündə təkfirin hansı növündən söhbət gedir? **"Allahın nazil etdiyi ilə hökm etməyənlər əlbəttə ki kafirlərdirlər!"** *(Maidə:44)*

**Cavab:** Allaha həmd, Onun Elçisinə, ailəsinə və səhabələrinə salam və salavat olsun.

Sizin: ***"Təkfir nə zaman caizdir və nə zaman caiz deyildir?"*** sözünüzə gəldikdə isə düşünürük ki, hökmü sizə açıqlamağımız üçün məsələnin sizi narahat edən məqamlarını bizə izah etməlisiniz. Allah taəlanın: ***"Allahın nazil etdiyi ilə hökm etməyənlər əlbəttə ki kafirlərdirlər!"*** - sözünə gəldikdə ayədə deyilən bu küfr böyük küfrdür. Qurtubi Təfsirində *(6/188)* demişdir: "İbn Abbas və Mucahid demişlər: ***"Kim Quranı və Allahın Elçisinin*** *(sallallahu aleyhi və səlləm)* ***sözünü inkar edərək Allahın nazil etdiyi ilə hökm etmirsə o zaman o kafirdir".***

Allahın nazil etdiyindən başqası ilə hökm verən bu işinin günah olduğunu etiqad edər, rüşvətə, məhkuma bəslədiyi düşmənçiliyə, yaxud məhkumla qohumluğu, dostluğu və s. belə amillərə görə başqa hökm ilə mühakimə edərsə, bu əməl böyük

küfr ola bilməz. Belə halda o günahkar olar. Küfr sayılan bu günah böyük küfrdən aşağı mərtəbə olan küfr, böyük zülmdən aşağı mərtəbədə olan zülm, asilikdən aşağı mərtəbədə olan asilikdir. Müvəffəqiyyət Allahdandır. Allahın salamı və salavatı Onun Elçisinə, ailəsinə və səhabələrinə olsun!
Daimi Elmi Araşdırmalar və Fətvalar Komitəsi
**Prezident:** Əbdül Əziz ibn Abdullah ibn Bəzz
**Vitse Prezident:** Əbdürrəzzaq Əfifi
**Üzv:** Abdullah ibn Ğudəyyan
**Üzv:** Abdullah ibn Quud

**Sual *(№11)* fətva *(№5741)*:** Allahın nazil etdiyindən başqası ilə hökm edən Müsəlmandır, yoxsa böyük küfr edən kafir? Onun əməlləri qəbul olunurmu?
**Cavab:** Allaha həmd, Onun Elçisinə, ailəsinə və səhabələrinə salam və salavat olsun.
Uca Allah buyurur: "**Allahın nazil etdiyi ilə hökm etməyənlər əlbəttə ki, kafirlərdirlər!"** *(Maidə:44)*, "**Allahın nazil etdiyi ilə hökm etməyənlər əlbəttə ki zalımlardırlar!"** *(Maidə:45)*, "**Allahın nazil etdiyi ilə hökm etməyənlər əlbəttə ki fasiqlərdirlər!"***(Maidə:47)*. Əgər bir rəhbər Allahın hökmündən başqası ilə hökm verməyi halal sayaraq icazəli olduğuna inanarsa, onun küfrü, zülmü, fasiqliyi böyük olar və bununla dindən çıxar. Yox əgər o bu işin haram olduğunu etiqad edərək, rüşvət və ya başqa məqsədlə edərsə, əməli kiçik küfr, zülm və fasiqlikdir və həmin insan günah sahibidir. Elm əhli belə insanın Islamdan çıxamadığı qənaətindədirlər. Onlar, deyilən ayələrin təfsirində bu haqda geniş danışmışlar.
Müvəffəqiyyət Allahdandır. Allahın salamı və salavatı Onun Elçisinə, ailəsinə və səhabələrinə olsun.
Daimi Elmi Araşdırmalar və Fətvalar Komitəsi
**Prezident:** Əbdül Əziz ibn Abdullah ibn Bəzz
**Vitse Prezident:** Əbdürrəzzaq Əfifi
**Üzv:** Abdullah ibn Ğudəyyan

**Sual *(№3)* fətva *(№6310)*:** Dünyəvi qanunların batil olduğunu bildiyi halda ona qarşı mübarizə aparmayan və dəyişdirilməsinə səy göstərməyən insanın belə qanunlara müraciət etməsinin hökmü nədir?
**Cavab:** İxtilaf zamanı Allahın Kitabı və Elçinin *(sallallahu aleyhi və səlləm)* Sünnəsi ilə hökm etmək vacibdir. **Uca Allah buyurur: "Əgər bir iş barəsində mübahisə etsəniz, Allaha və qiyamət gününə inanırsınızsa, onu Allaha və Peyğəmbərə həvalə edin! Bu, daha xeyirli və nəticə etibarilə daha yaxşıdır".** ***(Nisə:59)*** **"Amma xeyr! *(Ey Elçim!)* Rəbbinə and olsun ki, onlar öz aralarında baş verən ixtilaflarda səni hakim *(münsif)* təyin etməyincə və verdiyin hökmlərə**

Peyğəmbər *(sallallahu aleyhi və səlləm)*, müsəlmanın eyibni gizlətməyi və onun üçün üzr axtarmağı əmr edərək buyurmuşdur: ***"Qardaşınız üçün üzr axtarın"*** [114]. Ona görə müsəlman digər müsəlmanların eyiblərini gizlətməyə, onları cəzalara və ölümə məhkum olunmaqdan qorumağa çalışmalıdır. Bütün bunlar, şəriət sahibinin məqsədlərindən sayılır. Kiminsə küfr etdiyini ehtimal edərək onu təkfir etməyə can atmaq, Allahdan qorxmağın əlaməti deyildir.

Ən böyük Allah qorxusu, müsəlmanları təkfir etməkdən, namuslarına toxunmaqdan, qanlarına əl batırmaqdan uzaq olmaqdır. Həmçinin demək lazımdır ki, insan əlində olan nemətə görə Allaha şükür etməlidir. Bəzi insanlar hər hansı bir pis vəziyyətdə olanda: Nə üçün mən bu vəziyyətdəyəm? Nə üçün bu ölkədə olan müsəlmanlar belə vəziyyətdədir? – deyərək şikayətlənir, söyür və təhqir edir, olduğu vəziyyətin bu yolla dəyişməsini istəyir. Təbii ki, bu hərəkət açıq-aşkar səhvdir. Peyğəmbər *(ona və ailəsinə Allahın salavatı və salamı olsun!)*

---

**görə özlərində bir sıxıntı duymadan sənə tam bir itaətlə boyun əyməyincə, *(həqiqətən)* iman gətirmiş olmazlar. *(Nisa:65).***

Buna görə mühakimə zamanı Uca Allaha və Onun Elçiunun *(sallallahhu aleyhi və səlləm)* Sünnəsinə müraciət edilməlidir. Əgər kimsə maddi və ya hansısa mənfəət üçün dünyəvi qanunla hökm verərsə belə insan özünü İslamdan çıxarmayan günah, fasiqlik, asilik edər.

Müvəffəqqiyyət Allahdandır. Allahın salamı və salavatı Onun Elçiuna, ailəsinə və səhabələrinə olsun.

Daimi Elmi Araşdırmalar və Fətvalar Komitəsi

**Prezident:** Əbdül Əziz ibn Abdullah ibn Bəzz

**Üzv:** Abdullah ibn Ğudəyyan

**Üzv:** Abdullah ibn Quud

[114] Beyhaqinin *Şuabul İman (6/323)* əsərində, Muhəmməd İbn Sirindən belə dediyi qeyd olunur: "Sizə qardaşınızla əlaqədar bir xəbər gələndə, o zaman onun üçün üzr axtarın. Əgər onun üçün üzr tapa bilməsəniz, o zaman: "Onun üzrü var"- deyin. Beyhəqi həmçinin *Şuabul İmanda (7/552)* Həmdun əl-Qassarın belə dediyini qeyd edir: "Qardaşlarınız arasından birinin ayağı büdrəyəndə, o zaman onun üçün yetmiş üzr axtarın. Qəlbiniz bunu qəbul etməsə, o zaman bilin ki, xata sizin nəfsinizdədir. Çünki Müsəlman üçün yetmiş üzr yeri qoyulduğu halda qəlbiniz bunu qəbul etmədi!".

buyurmuşdur: ***“Allahın nemətlərinə naşükür qalmamanız üçün, özünüzdən*** *(vəziyyətcə)* ***aşağı olana baxın, yuxarı olana baxmayın!”***[115].

Əgər bir nəfər xəstələnibsə, o digər sağlam insanlara baxıb: Nə üçün mən xəstə, bunlar isə sağlamdır? – deməz. Əksinə daha pis xəstələrə baxdıqda, Allahın ona rəhm etdiyini bilib öz vəziyyətinə şükr edər. Həmçinin orta səviyyəli insan yüksək səviyyəli insanlara deyil, yemək tapmayan kasıblara baxıb Allaha şükr etməlidir.

Bu gün müxtəlif ölkələrdə yaşayan insanlar Peyğəmbərin *(ona və ailəsinə Allahın salavatı və salamı olsun!)*, yaxud səhabələrin vəziyyətinə baxıb, indi də o dövrdəki kimi olmasını istəmədən, Allahın ona verdiyi nemətə görə həmd etməlidir. Təbii ki, hamı istəyərdi ki, Peyğəmbərin *(ona və ailəsinə Allahın salavatı və salamı olsun!)* vaxtında olan imanlı günləri yaşasın, lakin bu real deyil. Hətta Peyğəmbərdən *(ona və ailəsinə Allahın salavatı və salamı olsun!)* sonrakı vəziyyət yalnız Ömər ibn Əbdüləzizin zamanında mövcud olmuşdur. Ona görə fitnələrin çox olduğu bu gündə, insan özündən aşağı insanlara baxmalıdır. Elə ölkələr vardır ki, orada yaşayan insanlar saqqal buraxıb və ya hansısa əməli edib əməlisalehlər kimi gəzə bilmirlər. Bunları etdikdə isə ona əziyyət verir, cəzalandırırlar. Digərləri sübh namazına gedə bilmirlər. Yəni, buna icazə vermirlər. Ona görə insan Allaha şükr etməlidir ki, mən bunları rahat icra edir, dindar, xeyirxah və əməlisalehlərdən olduğum üçün başımı dik tuturam!

Bu ölkədə elmli, xeyirxah, əməlisaleh adamlar təqdir edilirsə bu o demək deyil ki, burada səhvlər, şəriətə zidd əməllər yoxdur. Təbii ki, vardır. Hansı zamanda səhvlər və ya şəriətə zidd əməllər mövcud olmamışdır ki!

Müsəlman, mövcud vəziyyətini qorumalı və daha yaxşı şərait əldə etmək üçün doğru yollar araşdırmalıdır. Təbii ki, indiki vəziyyətini pisləşdirərək daha yaxşısını əldə etmək üçün çalışmaq axmaqlıqdır. Əksinə, sən indiki vəziyyətini qoruyub saxla, sonra

---

[115] Müslim (№2963) rəvayət etmişdir.

doğru yollarla daha yaxşı vəziyyət üçün çalış. Müsəlman ölkələri arasında rəhbəri küfr ilə vəsf edilən bir rəhbər var idi. Orada alimlər çox əziyyət içindəydilər. Hətta bəziləri qətlə yetirilmiş, asılmış, müxtəlif əzablara düçar olmuşdular. Sonra həmin ölkədə fitnə oyandı və vətəndaş müharibəsi başladı. Əvvəlki dövlət dağıldı və insanlar təşviş içində yaşamağa başladılar. Belə olduğu halda nahaq qanlar axıdılır, namuslara toxunulur, yollar kəsilir, insanlar aclıqdan ölürdülər. Ona görə həmin ölkədə yaşayan bəzi alimlər deyirdilər: "Kaş ki, biz əvvəlki vəziyyətimizdə qalaydıq! O vəziyyət bundan çox yaxşı idi. Düzdür əvvəlki vəziyyətimiz o qədər də yaxşı deyildi, lakin indiki vəziyyətimiz ondan da pisdir. Biz bununla nə dinə, nə də dünyaya nail olduq." Ona görə böyük fəsadı dəf etmək üçün kiçik fəsaddan istifadə edilməlidir. Bu, şəriət qaydalarından biridir.

Uca və Nöqsansız Allahdan bizim hamımızı Kitabı, Elçisinin *(sallallahu aleyhi və səlləm)* Sünnəsi, əməlisaleh sələflərin *(Allah onlardan razı olsun!)* məzhəbini anlamağı, bizə haqqı haqq kimi göstərib ona itaət etməyi, batili batil kimi göstərib ondan çəkinməyi nəsib etməsini diləyirəm. Həmçinin Allahdan istəyim budur ki, zəlalətə düşməmək üçün həqiqəti bizə şübhəli etməsin. Həqiqətən hər şey Allahın əlindədir və O, hər şeyə qadirdir. Sonda, Allahın salavatı və salamı Peyğəmbərimiz Muhəmmədə, onun ailəsinə və səhabələrinə olsun!

# Mündəricat